MƏKTƏB KİTABXANASI



NİZAMİ GƏNCƏVİ

# POEMALAR

*(I kitab – ixtisarla)*





"MAARİF" NƏŞRİYYATI
BAKI – 2002

83.3(0)9

N 65

Tərtibçilər: *Şəmistan MİKAYILOV,*
*pedaqoji elmlər doktoru,*
*professor.*
*Asya BƏKİROVA,*
*pedaqoji elmlər namizədi,*
*dosent.*

Rəyçi: *A.C.HACIYEV,*
*filologiya elmləri doktoru,*
*professor.*

Redaktor: *Əbülfəz NAXÇIVANLI.*

**Nizami Gəncəvi**
N 65 Poemalar (*I kitab — ixtisarla*). "Məktəb kitabxanası" seriyasından. Tərtib. Bakı, "Maarif" nəşriyyatı, 2002.— 240 səh.

Kitaba Nizami Gəncəvinin "Sirlər xəzinəsi", "Xosrov və Şirin", "Leyli və Məcnun" poemalarından parçalar daxil edilmişdir. Ümumi süjet və ideya saxlanmaqla şagirdlərin yaş və bilik səviyyələrinə uyğun hissələr seçilmiş, poemaların məzmunu ixtisarla verilmişdir.

Kitab həmçinin geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.

N $\frac{4702060102-19}{M\ 652-2002}$ 2002 83.3(0)9



# AZƏRBAYCANIN DAHİ ŞAİRİ

*Bu meydanda sanma asandır durmaq,*
*Nizamilə pəncə-pəncəyə vurmaq.*
*Nizamiyə pəncə uzatsa hər kəs,*
*Qırılar pəncəsi, murada yetməz.*
*Şir pəncəsi gərək şirlə edə cəng*
*Barı şir olmasa, qoy olsun pələng.*
*Yığılsa bir yerə çaqqalın yüzü,*
*Tüpürcəyə layiq onların üzü.*
*Nizami bir fildir yox bərabəri,*
*Söz incisi ondan aldı dəyəri.*

*Əlişir NƏVAİ.*
*"Fərhad və Şirin" poemasından.*

Nizami Gəncəvi Azərbaycan xalqının bəşəriyyətə bəxş etyi dahi şəxsiyyətlərdən biridir. O, humanist, mütəfəkkir ir kimi şöhrət qazanmışdır. Səkkiz yüz ildən artıqdır ki, ərləri dünya bədii söz xəzinəsinin incisi kimi sənət sərrafının diqqətini cəlb edir. Nizami əsərlərində qaldırdığı bəri ideyalarla bir-birini əvəz edən bütün nəsillərin, eləcə də zim mənəvi müasirimizdir.

Nizami Gəncəvi 1141-ci ildə Azərbaycanın qədim şəhərlədən biri olan Gəncədə doğulmuş, ömrünün axırına qədər ada yaşamış, yazıb-yaratmışdır. Nizami 1209-cu ildə vəfat mişdir.

Şairin əsl adı İlyas, atasının adı Yusifdir. Nizami onun xəllüsüdür. İlyas Yusif oğlu sənət meydanına atılarkən lizami" təxəllüsünü təsadüfi seçməmişdir. Bu təxəllüs un həyatda və həyatının mənası saydığı poeziyada qarşısı qoyduğu məqsədləri son dərəcə dəqiq ifadə edirdi. "Niza" — "nizamlayan, nizam verən, qaydaya salan" deməkdir. kcə sözümü? Məncə, yox! Həm də insanın daxili aləmini, un cəmiyyətlə, cəmiyyətin təbiətlə münasibətlərini. Əlbətsöz vasitəsilə. Nizami poeziyası əvvəldən-axıra bu nizan, bu ahəngin, bu harmoniyanın axtarışı və ifadəsidir" üstəm Əliyev).

Nizami Gəncə şəhərində mədrəsə təhsili almışdı, lakin o, dövrünün bir sıra elm sahələrinə (fəlsəfə, tibb, həndəsə, astronomiya və s.) dərindən bələd olmuşdur. Bunlarla yanaşı, dünya mədəniyyəti, xüsusilə yunan, ərəb, fars mədəniyyəti ilə, Qafqaz xalqlarının tarixi ilə maraqlanmış, onların folklorunu öyrənmişdir. Nizami ərəb, fars dillərini mükəmməl bilmiş və bir sıra dillərə yaxından bələd olmuşdur. O, bunlara müstəqil mütaliə yolu ilə nail olmuşdur. Müstəqil mütaliə şairin dərin, hərtərəfli bilik qazanmasına imkan vermişdir. Şair özü "Yeddi gözəl" poemasında bu haqda deyir:

Dünyada nə qədər kitab var belə,
Çalışıb, əlləşib gətirdim ələ.
Ərəbcə, dəricə, yeri düşərkən,
Buxari, Təbəri əsərlərindən
Oxudum, oxudum, sonra da vardım,
Hər gizli xəznədən bir dürr çıxardım.
Əlimə yetişən hər bir varaqdan
Nüsxələr bağladım mən zaman-zaman.
Onda ki, fikrimi saldım sahmana,
Dedim ki, qoy onu düzüm dastana.
Oxuyan bəyənib afərin desin,
Ariflər, alimlər mənə gülməsin.

Bu misralardan aydın olur ki, Nizami hər hansı əsərini yazarkən müxtəlif dillərdə onunla əlaqədar olan mənbələrə nəzər salmış, zəngin məlumat topladıqdan sonra fikrini bədii dillə ifadə etmişdir.

Nizami Gəncəvini dünya bədii fikir tarixində tanıdan onun "Xəmsə"sidir. Lakin bir həqiqəti də qeyd etmək lazımdır ki, o, "Xəmsə"yə daxil olan poemalarını yazmamışdan əvvəl də müqtədir bir şair kimi məşhurlaşmış, böyük şöhrət qazanmışdır. Şair o vaxta qədər lirik janrın rübai, qəzəl, qəsidə və s. kimi növlərində öz qələmini sınaqdan keçirmiş və lirik şair kimi tanınmışdır. Nizami yaradıcılığı üzrə aparılan tədqiqat əsərlərindən aydın olur ki, şair 20 min beytdən artıq lirik şerin müəllifi olmuş və Dərbənd hökmdarı Nizami sənətinə (bu vaxta qədər Nizami məhz lirik şair kimi tanınmışdı) hörmət əlaməti olaraq ona Afaq adlı gözəl bir kəniz göndərmişdir. Lakin çox təəssüf hissi ilə qeyd etməliyik ki, onun lirik şerlərinin hamısı zəmanəmizə qədər gəlib



çatmamışdır. Hətta şairin lirik şerlərindən divan bağladığı faktı da məlumdur. Bu barədə daha aydın, dəqiq qənaətə gəlmək üçün "Leyli və Məcnun" poemasının "Kitabın yazılmasının səbəbi" hissəsindən aşağıdakı misraları xatırlamaq kifayətdir:

Bir gün nəşəliydim, aləm şad kimi,
Dəmlər içindəydim Keyqubad kimi.
Qaşlarım açıqdı, sanki bir kaman,
Qarşımda dururdu yazdığım divan.
Üzümə tutmuşdu güzgüsünü baxt,
Səadət saçımı darardı o vaxt...
Bayraq qaldırmışdım söz zirvəsinə,
Hünər lövhəsini yazırdım yenə.

Gətirilən misralardan məlum olur ki, şair divan müəllifi olmuş, sənət dünyasında söz ustadı kimi şöhrət tapdığından bəxt onun üzünə gülürdü. O, irihəcmli əsərlərini yazmamışdan əvvəl də söz zirvəsinə bayraq qaldırmışdı. Lakin bütün bunlara baxmayaraq Nizami Gəncəvini əbədiyyət göylərində pərvazlandıran, ona ölməzlik gətirən, onu sənət dünyasında ilahiləşdirən şairin poemaları — "Xəmsə"sidir.

Bu ad altında birləşən əsərlər Nizami yaradıcılığının təsir dairəsini daha da genişləndirir və onu ədəbi məktəb səviyyəsinə yüksəldir. Təkcə bu faktı xatırlamaq kifayətdir ki, Nizamidən sonra Şərq ədəbiyyatında "Xəmsə" yaratmaq bir sıra böyük sənətkarların yaradıcılıq amalı olmuş, Nizami qəhrəmanları ayrı-ayrı söz ustadları tərəfindən təkrar-təkrar işlənmişdir.

Nizami Gəncəvinin ilk böyük əsəri "Sirlər xəzinəsi"dir. Şair bu əsəri 1177-ci ildə yazmışdır. "Sirlər xəzinəsi"ndə vahid süjet xətti ətrafında cərəyan edən hadisə danışılmır. Şair bu əsərində özünün ictimai-fəlsəfi görüşlərini ifadə edən 20 söhbət (həmin söhbətlər bəzən məqalət adlanır) verir və hər bir əxlaqi-tərbiyəvi söhbətin ideyasına uyğun hekayə danışır. Əsərdə verilən söhbətlər oxucuya humanizm, xalqa hörmət, əməksevərlik, vətənpərvərlik, mərdlik, doğruçuluq, düzlük və s. kimi əxlaqi keyfiyyətlər aşılayır. Məsələn, "Sirlər xəzinəsi" əsərində ikinci söhbət (məqalət) "Ədalətli və insaflı olmaq haqqında şaha nəsihət" adlanır. Şair ölkənin ədalətlə idarə olunması barədə öz düşüncələrini söyləyir və fikrini:

Dünyaya fateh olmaz zülmkarlıq, rəzalət,
Yer üzünün fatehi ədalətdir, ədalət —

kimi əxlaqi nəticə ilə tamamlayır. Bu əxlaqi nəticənin doğruluğunu əsaslandırmaq üçün elə həmin söhbətlə əlaqədar "Nuşirəvanla vəziri və bayquşların söhbəti" hekayəsini danışır. Bu hekayədən çıxarılan nəticə "ikinci söhbət"dən çıxarılan nəticəni tamamlayır.

"Sirlər xəzinəsi" poemasını fars dilindən Azərbaycan dilinə S.Rüstəm və A.Sarovlu tərcümə etmişlər.

Nizami Gəncəvi qələminin məhsulu olan ikinci böyük əsər "Xosrov və Şirin" poemasıdır. Şair bu əsərini 1180-ci ildə tamamlamışdır. Doğrudur, "Xosrov və Şirin" poema adlanır, lakin hadisələrin əhatəliliyi, daha geniş planda verilməsi, qəhrəmanların keçdiyi həyat yolu, rast gəldikləri psixoloji çətinliklər onu bir ədəbi növ kimi mənzum roman adlandırmağa imkan verir.

Bu əsərin mövzusunu məhəbbət macərası təşkil edir, lakin şair aşiq və məşuq arasında cərəyan edən məhəbbətin təsviri ilə məhdudlaşmır, məhəbbət fonunda çox mühüm əxlaqi, sosial-siyasi problemlərə toxunur və onları demək olar ki, bədii cəhətdən həll edir. Poemada məhəbbətin təsirilə mənəvi təmizlənmə, daxili saflaşma diqqəti cəlb edir. Nizami əsərdə Şirindən mühüm tərbiyə vasitəsi kimi istifadə edir. Poemadan Şirinin Xosrova dediyi aşağıdakı sözlər bu baxımdan maraqlıdır:

Bəd duadan saqın, mehriban danış,
Pusquda durmasın yolunda qarğış.
Birdən qoca qarı, cavan ah çəkər,
Hədəfə ox vurar erkən bir səhər...
Dünyada zülm etmək qoçaqlıq deyil,
Rəiyyət bəsləmək çox yaxşıdır, bil.

Doğrudur, Şirin bu sözləri Xosrova xitabən deyir, lakin şair həmin sözlərlə hökmdarlara, böyük səlahiyyət sahiblərinə həyat dərsi verir. Buradan aydın olur ki, şair məhəbbəti çox mühüm tərbiyə vasitəsi kimi mənalandırmışdır. Bunun nəticəsidir ki, Xosrovla Şirin arasında cərəyan edən məhəbbət Xosrovun tərbiyəsinə təsirsiz qalmır. Şirinin təkidilə Xosrov çirkin əməllərdən uzaqlaşır, daxilən təmizlənir və insan kimi kamilləşir. Əsərin əvvəllərində şahzadə şıltaq



ə diqqəti cəlb edən Xosrov Şirinin təsirilə tədricən pis əməllərdən çəkinərək haqq-ədalət yoluna düşür, onda insana, əmələ, sənətkara hörmət hissi yaranır, ağıl-kamal sahibi olur. Bütün bunlar Şirini Şərq ədəbiyyatında ilk və təkrarolunmaz müsbət qadın obrazı kimi oxucuya sevdirir.

"Xosrov və Şirin" poemasında diqqəti cəlb edən məsələlərdən biri də əməyə, əmək adamlarına, sənətə, sənətkara münasibətdir. Poemada Fərhad mahir sənətkardır və əmək adamlarını təmsil edir. Doğrudur, əsərin baş qəhrəmanı Xosrovdur, lakin Nizami Fərhadı elə yüksək səmimiyyət və məhəbbətlə işləmiş, oxucuya elə təqdim etmişdir ki, oxucu onu istər-istəməz əsərin əsas qəhrəmanlarından biri hesab edir. Bu, Nizaminin özünün əməyə, əmək adamlarına olan münasibətidir. Poemadan çıxarılan mühüm əxlaqi nəticələrdən biri də budur ki, insan bütün çətinliklərdən əməklə, zəhmətlə çıxa bilər.

"Xosrov və Şirin" poemasını Azərbaycan dilinə şair R.Rza tərcümə etmişdir.

Nizaminin "Xəmsə"yə daxil olan üçüncü böyük əsəri 1188-ci ildə yazdığı "Leyli və Məcnun" poemasıdır. Həm də bu əsər "Leyli və Məcnun" mövzusunun yazılı ədəbiyyatda ilk nümunəsidir. Belə ki, bu məhəbbət macərası Nizamidən çox-çox əvvəl ərəb şifahi xalq ədəbiyyatında var idi, onun müxtəlif variantları ağızdan-ağıza düşüb rəvayət şəklində danışılırdı. Həmin rəvayətləri ilk dəfə bir süjet ətrafında birləşdirib sənət əsəri kimi işləyən Nizami Gəncəvi olmuşdur.

Məlumdur ki, "Leyli və Məcnun" mövzusunda əsər yazmağı Nizamiyə Şirvan şahı Axsitan təklif etmişdir. Lakin şair bu təklifi məmnunluqla qəbul etməmiş, müəyyən tərəddüd keçirmişdir. Şairi tərəddüdə salan səbəblərdən biri də mövzunun kədərli, qüssəli məzmuna malik olması idi. Poemanın "Kitabın yazılmasının səbəbi" hissəsində Nizami bu mövzuya münasibətini belə ifadə etmişdir:

...Bu ayə olsa da aləmə bəlli,
Qəlbə gətirməyir şadlıq, təsəlli.
Şadlıqdır, eyhamdır sözün arğacı,
Bunlarla düzəlir söz ehtiyacı.
Kədərlə, zəncirlə bağlansa dastan,
Sözlər çılpaq olar can sıxar inan.
Onu həddən artıq bəzəsən əgər,
Dastanın üzünə ləkələr düşər.

Kədər, qüssə dolu bu məhəbbət macərası hər şeydə şadlıq, sevinc axtaran nikbin ruhlu sənətkarın ürəyindən olmasa da o, yeganə və əziz oğlu Məhəmmədin xahişindən sonra "Leyli və Məcnun"u yazmağa razılıq verir və doqquz min misraya qədər olan bu əsəri 4 aydan az bir müddət içərisində tamamlayır.

Əsərdə azad sevgi, saf məhəbbət, humanizm və s. nəcib insani sifətlər təbliğ edilir. Bununla yanaşı, biz əsərdə şairin öz qəhrəmanlarının yaşadıqları mühitə, orta əsr feodal qayda-qanunlarına qarşı etirazını da görürük.

"Leyli və Məcnun" poemasını Azərbaycan dilinə xalq şairi S.Vurğun tərcümə etmişdir.

"Leyli və Məcnun" poemasından sonra, Nizami Gəncəvi dördüncü böyük əsəri olan "Yeddi gözəl" poemasını 1197-ci ildə yazıb tamamlamışdır. Əsərdə təsvir olunan hadisələrin mərkəzində Sasanilər sülaləsinin beşinci hökmdarı Bəhram-Gur dayanır. Bəhram haqqında əsər yazan təkcə Nizami olmamışdır. Hələ Nizamidən əvvəl Bəhramın həyat və fəaliyyəti Firdovsinin "Şahnamə"sində geniş bədii əksini tapmışdır. "Yeddi gözəl" poemasının "Kitabı yazmağımın səbəbi" hissəsində deyilir:

...O zaman aradım, tarixə keçdim,
İncə ürək açan dastanlar seçdim.
Şahların çox uzun tarixi vardı,
Birindən bir əsər yazmaq olardı.
Bir dərin fikirli varmış ki, o, tək,
Yazmış bu şeyləri nəzmə çəkərək.
Yerdə qırıntılar qalmış o laldən,
Onu da çoxları buraxmaz əldən.
Gövhər ustadı tək mən də yaratdım,
Belə xəzinəni ortaya atdım...

Əlbəttə, Nizami deyilmişləri təkrar etməmiş, deyilməmişləri zərgər həssaslığı və ustalığı ilə Bəhramın şəxsində ümumiləşdirərək orijinal bədii obraz yaratmışdır.

"Yeddi gözəl" adı rəmzi məna daşıyır. Lakin əsərə verilən bu romantik addan düzgün nəticə çıxarmaq lazımdır. Burada söhbət təkcə Bəhramın gözəllərlə əylənməsindən getmir, şairi düşündürən hökmdar və xalq problemi bu poemanın da mərkəzi xəttini təşkil edir. Bəhram ölkəni idarə etməyi əmək adamlarından — çobandan öyrənir. O, Fitnənin sözləri qarşısında öz səhvini başa düşüb haqsız hərəkətindən peşman olur. "Yeddi gözəl" əsərində şair ölkənin abadlaşması, xalqın firavan yaşaması üçün hökmdarı ədalətli olmağa, xalqa arxalanmağa və ondan öyrənməyə çalışmışdır.



"Yeddi gözəl" poemasını Azərbaycan dilinə xalq şairi M.Rahim tərcümə etmişdir.

Nizaminin son böyük əsəri "İskəndərnamə" poemasıdır. Bu əsər, demək olar ki, Nizami yaradıcılığının zirvəsi, yekunudur. Şairin lirik şerlərində və digər poemalarında qaldırdığı ictimai problemlər bu əsərdə tam bədii həllini tapmışdır.

"İskəndərnamə"nin yazılma tarixi dəqiq göstərilməmişdir. Lakin əsərin özündən aydın olur ki, şair bu poema üzərində "Yeddi gözəl"dən sonra işləmişdir. "Şərəfnamə"də "Bu əsərin yazılmasının səbəbi" parçasında deyilir:

Yorulmaq bilmədən gündüz və gecə,
"Məxzənül-əsrar"ı yazdım əvvəlcə.
İncəlik, şirinlik yığaraq ondan,
"Xosrov və Şirin"çin düzdüm bir dastan.
Sonra başqa yerdə çadırı vurdum,
"Leyli və Məcnun"un eşqini qurdum.
Bitirdim dastanı, bir nəşə tapdım,
Atımı "Həft-peykər" üstünə çapdım.
İndi söz mülkündə büsat qураram,
İskəndər dövründən təbil vuraram.

Bu misralar sanki şairin "Xəmsə" üzərindəki işinin bədii hesabatıdır. Burda şairin poemalar üzərində nə zaman və necə işləməsi aydın şəkildə göstərilmişdir. "İqbalnamə"də "Nizaminin ruzigarının sonu" parçasındakı:

Bu dastan yazılıb qurtaran kimi
Köçmək xəyalına düşdü Nizami—

misralarından aydın olur ki, şair artıq həyatının son vaxtlarını yaşayırmış. Burdan da belə nəticə çıxarmaq olar ki, şair "İskəndərnamə"ni 1197-1209-cu illər arasında yazmışdır.

20 min misraya yaxın olan "İskəndərnamə" poeması iki hissədən ibarətdir: birinci hissə "Şərəfnamə", ikinci hissə "İqbalnamə" adlanır.

Nizami bu poemanı yazarkən Makedoniyalı İskəndəri öz əsəri üçün qəhrəman seçmiş, onun haqqında müxtəlif mənbələrdən material toplamış, onları öz idealına, istək və arzularına uyğun şəkildə işləyib möhtəşəm bir sənət əsəri yaratmışdır. Şair öz istək və arzularını, cəmiyyətə münasibətini, fəlsəfi görüşlərini, estetik ideallarını əsərdə ayrı-ayrı rəngarəng epik lövhələr vasitəsilə əks etdirmişdir. Şairin sənətkarlığı ondadır ki, o əsərin qəhrəmanı İskəndərin ölməzliyini mövhumi dirilik suyu ilə deyil, məhz real həyatla, cəmiyyətlə əlaqələndirmişdir:

İskəndər bir böyük yol təqib etdi,
Dirilik suyunun dalınca getdi.
Əbədi qalmaqçın həyat suyundan;
Çox gəzdi, dolaşdı heç yorulmadan.
Dirilik suyunun olmadı sonu,
Ancaq indi tapdı həyat suyunu.

Nizami yaradıcılığı dərindən tədqiq olunduqca, bütün dolğunluğu ilə öyrənildikcə, daha böyük tərbiyəvi əhəmiyyət kəsb edir. Məhz bu cəhət şairin ədəbi irsinin tədqiqinə, təbliğinə və nəşrinə diqqəti artırmağı tələb edir.

Nizami yaradıcılığının geniş təbliği işində ümumtəhsil məktəblərinin üzərinə də böyük vəzifə düşür. Şairin əsərlərinin öyrənilməsinə maraq oyatmaq lap aşağı siniflərdən başlanır. Məktəb proqramlarını ~airin əsərlərinin öyrənilməsinə geniş yer verilir.

Nizaminin əsərləri Azərbaycanda bir neçə dəfə nəşr olunub oxuculara çatdırılmışdır. Lakin bu nəşrlərin heç biri ümumtəhsil məktəbi şagirdlərinin tələbini tam ödəmir. Orta məktəb proqramlarında (ayrı-ayrı siniflər üçün) məktəblilərin Nizaminin yaradıcılıq xüsusiyyətləri ilə, əsərlərində irəli sürdüyü və bədii həllini verdiyi bəşəri ideyalarla yaxından tanış olmaları tələb edilir. Lakin dərsliklərdə şairin əsərlərindən verilən ayrfı-ayrı parçalar proqramın tələbini ödəmir "Xəmsə"ni isə məktəbliyə tam şəkildə oxutdurmaqda müəyyən çətinliklər meydana çıxır. Bu çətinlik əvvələ, "Xəmsə"nin həcmi, mövzuların geniş epik təsviri, epik fəlsəfi vüsəti, bədii siqləti ilə bağlıdır. İkincisi, respublika məktəblərinin kitabxanalarında şairin əsərlərinin azlığıdır. Şagird hikmət və tərbiyə çeşməsi olan bu əsərləri dərin maraqla oxumağa səy göstərir, lakin onları istədiyi vaxtda tapa bilmir. Üçüncüsü, Nizaminin əsərləri bu vaxta kimi Azərbaycan dilində kiril qrafikasında çap olunmuşdur. Hazırda isə prezidentin fərmanı ilə latın qrafikasına keçilmişdir. Məktəblilər kiril qrafikası ilə lazımi sürətlə oxuya bilmədiyindən onların mütaliəyə marağı azalır.



Onu da deyək ki, "Xəmsə"yə daxil olan poemalar bütövlükdə məktəblilərin yaş səviyyəsinə uyğun deyil. Bütün bunlar göstərir ki, Nizami əsərlərinin pedaqoji baxımdan hazırlanıb çap olunmasına məktəblərimizdə böyük ehtiyac vardır.

"Məktəb kitabxanası" seriyasından çap olunan bu kitab məhz həmin ehtiyacı ödəmək məqsədi ilə tərtib edilmişdir.

Kitabda məktəblilərin yaş xüsusiyyətləri nəzərə alınmış, pedaqoji cəhətdən lazım bilinməyən bir sıra ifadələr, sözlər ixtisar edilmişdir. Lakin poemaların süjet bütövlüyünün saxlanması diqqət mərkəzində olmuşdur.

Əsərlərdəki çətin sözlərin, ayrı-ayrı misra və beytlərin izahı hər səhifənin axırında verilmişdir.

*Tərtibçilər.*

## SİRLƏR XƏZİNƏSİ

Şəfqətli, ədalətli tanrının adı ki var,
Hikmət xəzinəsini açan açardır, açar.
Hər sözün, düşüncənin odur əvvəli, sonu,
Nə söyləsən, tanrının adıyla qurtar onu.
Qüdrətlə varlığa həyat verər həyatda,
Əbədiyyat timsalı özüdür kainatda...
Dəyişməzdir varlığı, dəyişməzdir xisləti,
Dəyişdirər varlığı, kainatı, xilqəti.
Əzəməti yanında iki dünya əbəsdir,
Əvvəlimiz, sonumuz anicə bir nəfəsdir...
Dünyanı yaratmağa o, can atdığı zaman
Dolaşıqdı fələyin çətin işləri yaman.
Məşəqqətli düyünü açdı qadir əməli,
Gecənin saçlarından qopdu gündüzün əli.
Cavahir boyunbağı göyün boynunda yandı,
Gecənin qıvrım saçı ulduzlarla darandı.
Kəməndindən çıxmağa məgər fələk çalışdı?
Torpağın kəmərində yeddi ulduz alışdı.
Günəş ağ qəba geydi, ay isə qara cübbə,
Yarandı mavi göydə dümağ, qapqara qübbə.
Gövhər səpən buludlar mirvari səpsin deyə,
Göydə qopdu gurultu, şimşək döndü nizəyə.
Qəlbindən dərya açdı buludların zöhrəsi,
Xızırın çeşməsilə güldü çəmən çöhrəsi.
Kəhrəba zərrə yağdı sübhün camı günəşdən,
Daşlar yağan zərrəni təşnətək uddu dən-dən.
Suyla od ülfət tutdu təbiətdə birinci,
Daşda yaqut yarandı, bəyaz sədəfdə inci.
Buxarlandı küləkdən yerin ürək qanı — su,



Daşın qanlı bağrında qana qatdı yaqutu...
Dərgahına pərdədir hicablı fələk ki var,
Pərdəsini yırtmağa əl atmamış ruzigar.
Sökə bilsə pərdəni, fələk çətin sökərdi,
Söksəydi, göy üzünü yer üzünə tökərdi...
Könül can aynasının qubarını hey silər,
Qapısının torpağı olmağı şərəf bilər.
Gül-çiçəyə can verər dərgahının torpağı,
Gülzarının yanında yalandır İrəm bağı.
Qüdrətinə sübutdur Nizaminin varlığı,
Canı — vəhdət tarlası, könlü — gülüzarlığı

### MİNACAT

Sən, ey bütün varlığa həyat verən, can verən!
Gildən yaranmışlara nəfəs verən, qan verən!
Bayrağın altındadır, ulu tanrı, xilqətin,
Biz səninlə mətinik, sənsə əzəldən mətin.
Mümkünmüdür bənzədək varlığını bir şeyə?
Kimsə sənə bənzəməz, bənzəməzsən kimsəyə.
Dəyişməyən özünsən bu sonsuz kainatda,
Ölməzliyin timsalı varlığındır həyatda.
Biz hamımız faniyik, əbədiyyət sənindir,
Uca göylər, qüdsiyyət, təmiz niyyət sənindir...
Səndən danışmayanda susa bilmək yaxşıdır,
Sənsiz yada nə düşsə yaddan silmək yaxşıdır.
Nur camından nur içər gecənin saqisi Ay,
Səhərin qumruları damında salar haray.
Təklikdə görün gözə, aç üzdən pərdəni sən,
Qurtar gün camalınla bu zülmətdən məni sən.
Gücün gücsüz fələyi təzələsin yenidən,
Dünyanın kələfini çözələsin yenidən.
Poz belə bir dövranın xeyirlə şər işini,
Dağıt səyyarələrin seyrini, gərdişini.
Kəs dillərin sözünü, kəs dillərin özünü,
Əzəlki fənalığa qaytar yerin özünü...
Sənsən qütbə mətanət, çarxa dövran, hərəkət,
Varlıq bağı suyundan alıb bəhər, bərəkət.
Qönçə açıb ağzını deyir ki: kölənəm mən,

Gülün canı olsam da, sənsiz tez ölənəm mən.
Nəsimdən xumar deyil nəstərəni bu bağın,
Gözünə tutiyatək işıq verib torpağın.
Şölə saçan çırağa döndərmisən süsəni,
Dil açıb, öz dilində alqışlayır o səni.
Nizami vəhdətinin carçısı bir bəndədir,
Hər iki dünyada da nicat gözü səndədir.
Düşüncə dünyasını hünərlə abad eylə,
Boynunu qəm yükündən ömürlük azad eylə.

## PEYĞƏMBƏRİN MERACI

Gecənin bir aləmi o günəş göydə yandı,
Aləmi nurlandıran məşəli alovlandı.
Fələk kəcavəsinə göz olmuşdu gözüylə,
Ay, Zöhrə məşəlini gəzdirirdi özüylə.
Yeddi iqlim, altı səmt, dörd cəhət öz yerində,
Kainatın özü də yox oldu nəzərində.
Gündüzün ürəyini həsrəti oda yaxdı,
Gecənin qulağına vüsalı sırğa taxdı.
Düşməninin gözləri gedən zaman yuxuya,
Yuxunu cilovladı o, ülvi bir duyğuya.
Dünyanın qəfəsində qəlbi sıxılır deyə,
Uçdu könlünün quşu səssiz-səmirsiz göyə.
Qanad salıb dayandı qulluğunda mələklər,
Sevincindən bilmədi heç neyləsin fələklər...
Müşayət eləyənlər özlərini yordular,
Əldən-dildən düşdülər, dirəndilər, durdular.
O, qərib yolçu kimi heyrətə düşdü daha,
Qapını döymək üçün yaxınlaşdı dərgaha.
O müqəddəs pərilər, mələklər artıq hanı?
Tənha qalan özüydü, bir də təxti-rəvanı.
Elə yolla getdi ki, yoxdu bircə sirdaşı,
Sirdaşı tənhalıqdı burda hər qədəm başı.
Kim onunla bu sirrin dərgahına yovuşdu,
Mənəvi aləmilə ülviyyətə qovuşdu.
O, xilqətin başına şərəfli bir tac oldu,
Ərş bu ülvi nemətə əbədi möhtac oldu.
Asimanda elə ki, başa vurdu yolları,



Bayrağını yellətdi ərşin büllur qolları.
O cismani varlığın yalnız nəfəsdi canı,
Onunla yol gedirdi can mülkünün sultanı.
Elə ki ərş evini dolaşdı başdan-başa,
Təlaş cana, ürəyə yol açdı başdan-başa.
Bədən öz xəznəsinə pənah apardı daha,
Göz onu axtarsa da, çətin tapardı daha.
Bir göz ki əzəl gündən qüdrətdən nur alıbdır,
Qaranlığa, zülmətə daim işıq salıbdır.
Yollar yoran qədəmi necə mətindi, mətin,
Göz önündən götürdü pərdəsini xilqətin.
Getdikcə sonsuz yollar çoxaltdı təlaşını,
Çıxartdı kainatın yaxasından başını.
Məkansız bir məkanın dərgahına çatanda,
Comərdliyin nuruyla nurlandı qəlbi canda...
Qüdrətini danma ki, kafirlik, xanlıq olar,
Yerini axtarma ki, o da avamlıq olar.
Sanma görüb-görüşdü peyğəmbər də özüylə,
Gördü ağlın gözüylə, ürəyinin gözüylə.
Başını qaldıraraq həqiqətin camını,
Mərhəmət badəsilə məst elədi hamını.
Tanrının iltifatı həmdəm oldu, öyündü,
Haqq-rəhimli, qılıqlı, o da ki, ərköyündü.
Şəkər dodaqlarına xoş təbəssümdü adət,
Dilədi ümmətinə bəxtiyarlıq, səadət.
Hikmət xəzinəsindən vara yetirdi cəhdi,
Bəxtəvərə döndərdi hər diləyi, hər əhdi.
İqtidar sahibitək döndü haqq dərgahından,
Yer üzündə hamidir o, hamıya yaxından,
Eşqin ülvi gücüylə göylərə yüksəldi də,
Bir nəfəsə getdi də, bir nəfəsə gəldi də.
Hər kəlamın, hər sözün möhürdür dilimizə,
Ətrin-can məlhəmidir, onu çox görmə bizə.
Bu comərdlik mülkündə ol səxavətli hami,
Qoy sözünü şəninlə başa vursun Nizami.

## PEYĞƏMBƏRİN MƏDHİ

...Sən, ey müqəddəslərin hər birindən müqəddəs,
Qurban olmaq öyrətdin, qurbanın oldu hər kəs.

Şəfqət qəsri ucaldı xeyirxah əməlindən,
Əzab-zillət evini dağıtdın təməlindən.
Ərəb ariflərinə mahtabsan, nurlu aysan,
Əcəm hakimlərinə şahsan, arxa, haraysan.
Hamı sənə yol verir, yol verməzsən sən yada,
Dünyanın ağasısan olmasan da dünyada.
Öz səfər sovqatından comərd pay əsirgəməz,
Süfrəsini gen açar, sovqatını tək yeməz.
O süfrənin başında barındın hər nübardan,
Bizə nə gətirmisən daddığın tər nübardan?
Şəkər dodağını aç, şəkər yesin qoy hamı,
Dadıb şirin xurmanı əhsən desin qoy hamı.
Saçın zülmət gecətək sübhə çıxartdın bizi,
Eşq atəşin qaynatdı dirilik çeşməmizi.
Hüsnündən divanədir, yox halı aşiqlərin,
Zənciri saçlarındır sevdalı aşiqlərin.
Kəmərin gərdənbənddir, — çarx dolayıb boynuna,
Gün camalın nur saçır səhərlərin qoynuna.
Suya çəkib qurutdum aləmin ətəyini,
Ənbərinlə doldurdun torpağın göbəyini[1].
Türbətinin qübarı döndü ənbər ətrinə,
Yurdun ənbər vətəni oldu sənin xətrinə[2].
Torpağın ətirlidir Süleymanın mehindən,
Cənnət də ətirlənər gülzarının şehindən[3].
"Ulu tanrı!" dediyin doğma məkandı Kəbə,
Gülabına təşnədə, eşqinlə yandı Kəbə.
Tacın, taxtın vardı ki, dünya paytaxtın oldu,
Səma başının tacı, yer üzü taxtın oldu.
Kölgən ola bilərmi? Həşəmət nurusan sən,
Ülvi nur kölgəsisən, əzəmət nurusan sən.
İslamın sütunutək o dörd bayraq ucaldı,

[1] Beytin mənası: Günaha batmış, fitnə və fəsadla dolmuş aləm sənin sayəndə təmizliyə çıxdı, yerin göbəyi-mərkəzi, yəni Kəbə sənin sayəndə müşk saçmağa başladı.

[2] Yəni sənin məzarının saçdığı müşkdən sənin vətənin olan hicaz ətrafı ətir yağdırır.

[3] Dini əsatirə görə Süleyman (Bibliyada-Solomon) peyğəmbər təbiətin bütün ünsürlərinə hakim idi. O, əmr edərkən külək gül-çiçəkli çəmən və bağların üzərindən keçərkən ətir saçarmış. Beytin mənası: Sənin vətəninin torpağı sənin məzarının sayəsində Süleymanın küləklərindən daha ətirlidir.



Şəninə gecə-gündüz beş kərə təbil çaldı[1].
Oldu Məkkən, Mədinən çiçəklənən gülzarın,
Gözünə işıq gəldi hər bir qərib zəvvarın.
Mübarək qədəminə saçını tökdü gecə,
Başını ətəyinlə bürüdü, bükdü gecə.
Ətəyinə cavahir səpdin odlu baxışla,
Köynəyini bəzədi günəş zərli naxışla.
Nəsimin titrək əli saçına sığal vurdu,
Səhərin sədəfini ənbər ilə doldurdu.
At oynadıb meydanda səba əsirdi yenə,
Ənbər öz ordusuyla ona əsirdi yenə.
Ənbərin əsə-əsə satılması süftədi,
Versən iki cahana, bil ki, yenə müftədi.
Sidrə qəsrin önündə baş əyib kölgə salar,
Ərş-taxtını qurmağa cəlalına alçalar[2].
Varlığın — bu xilqətin nur saçan səhəridir,
Günəşin ərşi yaxıb zərrə kimi əridir.
Parlaq güzgü olmasa gündüzünə günəşin,
Nurunu saçardımı yer üzünə günəşin?!
Sən ki, iki cahansan, yerdə yatmağın nədir?!
Əgər xəznə deyilsən, yerə batmağın nədir?!
Torpaq altda olsan da, xəzinə billik səni,
Torpağa tapşırarlar hər yerdə xəzinəni.
Mənəvi xəzinəsən, viranən saya gəlməz,
Sayən — nurlu şamındır, pərvanən saya gəlməz[3].

[1] İslam dininin əsasını təşkil edən rükniləri beşdir: şəhadət, namaz, oruc tutmaq, zəkat və haca getmək. Burada "şəhadət" nəzərdə tutulmayıb, çünki 4 rükn ondan əmələ gəlibdir. Beş növbət (beş kərə) ifadəsi keçmişdə sultanların saraylarının qabağında qoyulmuş təbilin beş dəfə döyülməsinə işarədir. Həmin təbilin beş dəfə döyülməsi sultanlıq rəmzi olmuşdur. Misranın mənası: Sən allahın yerdə kölgəsi olan sultansan və sənin sultanlıq rəmzin isə beş rükət namazdır.

[2] Göyün doqquzuncu qatında bitən sidr ağacı sənin köynəyinin haşiyəsinə bənzəyir. Ərş, göydəki taxt isə sənin eyvanında sənin altına kürsü qoyan adi bir nökərdir.

[3] Əsatirə görə peyğəmbərin kölgəsi olmamışdır. Çünki pərvanə şam ətrafında yandığı kimi kölgə də Məhəmmədin vücudunun günəşi altında yanmışdır. Yəni bu dünyada sənin vücudunun xəzinəsi sənin viranəliyə bənzər yoxsulluğun içində gizlənmişdir, bu bəs deyildirmi? Bu dünyada sənə pərvanə olub sənin günəşli vücudunun nurunda yanan bəs deyildirmi, neçin qəbrin sayəsində daldalandın?





Çarxın nişangahını dəldi atdığın nizə.
Kəndirinlə salladın dolçasını kəhrizə[1].
Gündüzün al günəşi, gecənin nurlu ayı
Peyk olmasa yolunda, dolanmaz ki, havayı,
Kamalın loğmanısan, şəfası sənsən onun,
Ay da səni soraqlar, səfası sənsən onun.
Qalx, işıqlı səhərin üzümüzə açılsın,
Nizaminin üzündən şadlıq nuru saçılsın.

## BU KİTABIN YAZILMASI

Birovuz geydirmədim söz qızına donu mən,
Qəlbim nə yaz deyibsə yazmışam da onu mən.
Sənətin hər sehrinə yenə də əl atmışam,
Yeni qəlibdən çıxan bir heykəl yaratmışam.
Səhərtək əritmişəm gecələrin şamını,
Sehirkarlıq möcüzəm heyran qoyub hamını.
Yoxsula da, şaha da hikmət nuru saçmışam,
Ülviyyət xəznəsinin hər sirrini açmışam.
Şəkərimin üstündə yad milçək dolaşmayıb,
Yad şəkər şirəsinə milçəyim bulaşmayıb.
Nuh-sənət ümmanımda batar, kəsər səsini,
Xızır-sənət çeşməmdə sındırar kuzəsini.
Bütün şahlar adına püşk atdım bu gözələ,
Bəxtinə özün düşdün, öz adın gəldi ələ.
İki söz cəngavəri yaratdı iki əsər,
İki Bəhram adıyla adları dildə gəzər[2].
Qiymətli qızıllardı köhnə mədənin varı,
Mənsə yeni dəryadan yığdım inci-mirvarı[3],

[1] Kaman kimi əyri çərxi fələk sənin duaların oxunun hədəfi və oradak[ı] Dolça bürcünün çənbəri isə sənin quyunun kəndiridir. Başqa sözlə, pe[y]ğəmbərin göylərdə məskəni ən uca nöqtədir.

[2] Nizami burada iki kitaba və iki Bəhram şaha işarə edir. Birinci kit[ab] "Hədiqətül-həqayiq" poemasıdır. Onu məşhur İran şairi Sənai 1140-cı il[də] yazıb. Qəznə hakimi Yəmin əd-Dövlə Bəhram şaha (1118–1157) həsr e[t]mişdir. Nizami isə "Sirlər xəzinəsi"ni Kiçik Asiyada Ərzingan vilayəti ha[]kimi Fəxrəddin Bəhram şaha (1166–1225) göndərmişdir.

[3] *Dərya (bəhr)* — sözü burada iki mənada işlədilmişdir: a) Dəniz; [b)] Əruz vəzninin bəhri. "Sirlər xəzinəsi"ni səri (müftəilun, müftəilu[n], failun) bəhri ilə yazmışdır. Ondan əvvəl heç bir şair bu bəhrdə poem[a] yazmamışdır.



O Qəznədə ucaltdı sözün mülkündə bayraq,
Mənsə Rum sikkəsilə verdim sənətə növraq[1].
O sikkənin üstündə söz qızılı naxışdır,
Mənim xalis qızılım ondan daha yaxşıdır.
Aldığı bəxşiş qədər dövlətim yoxdur mənim,
Lakin ondan müştərim, alıcım çoxdur mənim...
Tozundan tuturam ki, bəlkə qalxım göylərə,
Sən məni çatdırmısan, mən çatmaram o yerə.
Bir-iki ay çalışıb, çox can atmışam ki, mən
Şahımın səcdəsində əhdə çatım yenidən[2].
Sədlərlə istehkamlar kəsmişdi sağ-solumu,
Hər yandan bağlamışdı mənim çıxış yolumu.
Görüşünə uçaraq can atırdım dərgaha,
Dəridən çıxmağa da, inan, hazırdım daha.
Yenə gördüm yolları aslandı, şirdi kəsən,
Dörd yanımı xəncərdi, odlu şəmşirdi kəsən.
Özümü cəsarətlə qılınca toxumuşam.
Qılınclar arasında xütbəni oxumuşam[3].
Söz çeşməmin suyunu qapına çiləmişəm,
Mən özümə qapıda qum olmaq diləmişəm.
Ey günəş, bir zərrəyəm, sən vermisən şüamı,
Tanrı səhər eşidər yəqin səhər duamı.
Könlüm incilər səpən coşqun dəryandı sənin,
Canımın gövhəriylə kəmərin yandı sənin.
Bu əbədi dünyada gündüz olsun hər gecən,
Tacının şöləsindən nurla dolsun hər gecən.
Səadətlə yaşasan bu dünyada sən indi,
Bundan gözəl səadət o dünyada sənindi.

[1] Yəni Sənainin "Hədiqətül-həqayiq" əsəri Qəznə hakiminə təqdim olunub orada qiymətləndirilib öz şöhrət bayrağını qaldırdı. "Sirlər xəzinəsi" isə öz sikkəsini Rum-Bizans sultanı Bəhram şahın adına vurdu.

[2] Bu beytdən məlum olur ki, "Sirlər xəzinəsi"ni yazmazdan əvvəl Nizami Bəhram şahla görüşübmüş.

[3] Bu beytlərdə Gəncə ətrafında müharibə getdiyinə işarə edilmişdir. Ola bilsin ki, Atabəy Cahan Pəhləvanın gürcü çarı ilə vuruşması nəzərdə tutulmuşdur.

## SÖZÜN TƏRİFİ

Dünya yaranan gündən qələmin ilkin sözü -
Varliq səhifəsində sözün özüdür, özü.
Açılanda varlığın sirli pərdəsi əzəl,
Söz oldu bu cahanda cilvələnən ilk gözəl.
Ürək sözə dil açdı, dedi ki: "Ver mənə can",
Yoxsa, yolmu tapardı bu cansız bədənə can?!
Yer üzünə incini sözlə saçıbdır qələm,
Kainatın gözünü sözlə açıbdı qələm.
Dünyaya sözdü şərəf, gör ki, nədir qiyməti,
Danışmaqla, yazmaqla itməz qədir-qiyməti.
Söz eşqin lüğətində öz canımızdır bizim,
Biz-sözük, görkəmimiz-eyvanımızdır bizim...
Sanma bayraq söz qədər zəfər çalar hər yanda,
Qələm öz qüdrətilə ölkə alar hər yanda[1]...
Söz dünyadan gözəldi, söz həyatdan gözəldi,
Qövsi-qüzehli göydən, kainatdan gözəldi.
Yer üzündə tapılmaz sözün rəngi-boyası,
Dilə gəlməz tərifi-dili aciz qoyası.
Söz bayraq qaldıranda ilham dolu könüldə,
Tərənnümə söz tapmaz sözlü ağız da, dil də.
Ürəyin tellərini sözlə təzələdi can,
Duyğular kələfini sözlə çözələdi can.
Şairi şah elədi şah əsərləri sözlə,
Möhürlədi məsləki məslək ərləri sözlə.
Sözü-qızıl yatağı altunla tutdu qoşa,
Dedi söz sərrafına: "De, hansı gəlir xoşa?
Səncə köhnə qızılmı, təzə sözmü yaxşıdır?"
Söz sərrafı söylədi: "Söz dünyanın naxşıdır"
Söz qasidi bələdsiz başa vurar yolları,
Söz-hünər meydanında yenər mərd oğulları.
Söz-gümüş sikkəsidir, dirhəm tozu da deyil,
Qızıl-itdən urvatsız, qorxaq tazı da deyil.
Söz hər yerdə hakimdi, hamıdan baş da odur,
Dünyanın sərvətidir, inci daş-qaş da odur.
Ürəksizlər qafildir ürək sözündən belə,

[1] Yəni şairlər təbiət mülkünə söz ilə hökmranlıq və padşahlıq edib[illegible]



Sözün şərhi artıqdır sözün özündən belə.
Söz durduqca, sorağı qoy dünyaya car olsun,
Nizaminin şöhrəti sözlə daim var olsun.

### BİRİNCİ SÖHBƏT

## ADƏMİN XİLQƏTİ

Nə "aşiq", nə də "məşuq" kəlməsi vardı hələ,
Nə varlığın varlığa gəlməsi vardı hələ.
Yoxluğa bəxtiyarlıq işığı saçdı Adəm,
Varlığın qapısını üzünə açdı Adəm.
Ondan əvvəl pəriydi, əcinnəydi həyatda[1],
Bəşərin ilk atası özüdür kainatda.
Xilafət bayrağını uca tutdu dağ kimi,
Endi də, yüksəldi də tutduğu bayraq kimi.
Pakdı ki, dərs alıbdı yerdə mələklər ondan,
Torpaqdan yaranıb ki, şərəfləndi yer ondan.
Cövhəri tutqunsa da, gövhər kimi safdı o,
Zərdi, məhək daşıdı, zərgərdi, sərrafdı o[2].
Göyün çılçırağından işıqlıdı kamalı,
Bəşərin varlığına bir aynadı camalı...
Səxavəti ucundan mənimsədi bir dəni,
Atdı gözəl cənnəti, dünya oldu məskəni[3].
Tora saldı özünü bir dənin ucbatından,
Minnətdarlıq üzrü də tez çıxartdı yadından.
"Alqış" sözü o gündən həmdəm, yardır aləmə,
Səcdəsinə əyilmək iftixardır aləmə,

[1] Adəmdən əvvəl pəri, cin və mələklər yaradıldığı üçün Adəm pərilərin axırıncı uşağı hesab olunur. Bu misranın məzmunu Quranın Əlhicr (15) surəsinin 27-ci ayəsindən alınmışdır. "Cinləri biz əvvəl səmum atəşindən xəlq etdik".

[2] Adəmin cövhəri, zatı bulanıqdır. Çünki onun cismi torpaqdan yaranıb. Təmiz və safdır. Çünki ruhu vardır. Məhək daşı isə ona görədir ki, savab və günah işləri yoxlasın. O, qızıldır, çünki insanlıq surətinə malikdir. Sərrafdır. Çünki yaxşını pisdən, xeyri şərdən seçə bilir.

[3] Fələyin quşları — mələklər. Mələklər Adəmə ona görə səcdə ediblər ki, Adəm mərhəmət və kəramət naminə buğda yeyib cənnəti atıb dünyaya gələndən sonra Tanrının ona öyrətdiklərini mələklərə öyrədib.

Bütün gözlər eylədi bu səcdəyə tamaşa,
Bir dönüyün səcdəsi yanlışdı başdan-başa[1].
Güllər səpdi üstünə cənnətin səkkiz bağı,
Hamıya qızılgüldü, İblisə bir göz dağı...
Taleyimiz hakimdi ürəyinə, beyninə,
Bir buğda bir arpaca gəlmədi heç eyninə!...
Buğdanın həsrətindən od tutub yandı bağrı,
Qəlbini buğda kimi yarı böldü bu ağrı.
Buğdatək nə anası, nə də atası oldu,
Torpaqdaca bəslənib tez boy atası oldu[2].
Bəsləyib böyüdəni bu yerdi, bu torpaqdı,
Una dönən buğda tək həmişə üzü ağdı.
Saman kimi sarıydı, qaraldı dərisi də,
Çillikdən ay üzünün xal-xaldı dərisi də[3].
Arpa, buğda sayağı sığındı Yer qoynuna,
Həqiqəti gizlədi, günah düşdü boynuna.
Cansız buğda nəydi ki, elə alçaldı Adəm,
Buğdanın sinəsitək lüt-üryan qaldı Adəm.
Şeytan vəsvəsəliydi, xaindi, yaramazdı,
Ürəyinə girməsə, buğda da aramazdı.
Dişbatmaz, qupquruca, daş kimi bir buğdanı,
Tamahlanıb yeyəndə ağıl, düşüncə hanı?
O zamandan ki, bəşər buğda dəni yeyəndir,
Buğda açıb ağzını: "Yeyim səni" deyəndir[4]...
Ey ömrünün kələfi dolaşan çaşqın bəşər,
Bircə buğdadan ötrü insan da tora düşər?
Arpa cadı yeməkdən heç zaman bezikmə sən,
Adəm tamah saldığı buğdaya göz dikmə sən.

[1] Bu beytlərin məzmunu Quranın "Əl-hicr" (15) surəsinin 30—33-cü ayələrindən iqtibas olunmuşdur. "Mələklər hamısı ona (Adəmə) səcdə etdilər. İblisdən başqa". O dedi: " Ey iblis, sənə nə olub ki, baş əyənlərlə bir yerdə səcdə etmirsən?" O cavab verdi ki, "Mən sənin quru torpaqdan, dağılmış gildən yaratdığına heç vaxt səcdə etmərəm".

[2] Yəni onun anası və atası yox idi, buğda kimi yerdən göyərib, daşın altında əzilib çörək-ruhi qida oldu.

[3] Yəni Adəm behiştdən çıxandan sonra onun bədəninin zərif dərisi günün altında yanıb saman rəngi aldı və ayın üzü qara ləkəsinə bənzər qara arpanı öz bədənindən dünyaya tökdü.

[4] Yəni buğda insanları cəzalandırmaq üçün ağzını açıb onları yemək istədi. Buğdanın ağzı deyərkən buğda dənəsini iki yerə bölən xətt nəzərdə tutulub.



Könülün qasidisən, iblisə müti olma,
Əmirin aslanısan, qapılar iti olma...
Günahkar, üzüqara gəlib çatdı bu yurda,
Bədnamlıq ləkəsini yuyub atdı bu yurda[1].
Paltarını boyadı fələyin lil küpündə,
Hindistanda yas tutdu, gözü yaşlıydı gündə.
Fələyin dilini də, yudu harda göz yaşı,
Gəndalaşlar bitirdi dərhal orda göz yaşı[2].
Ay kimi gözəlləşdi qənirsiz Çin gözəli,
Gizlədi öz saçını öz tacında öz əli.
Tövbənin riqqətilə qəlbi vurdu o vaxtdan,
Yer üzündə səltənət taxtı qurdu o vaxtdan.
Ədalət tarlasını vəfa xışı xışladı,
Bərəkətli torpağı bəşərə bağışladı.
Hər naz-nemət vermişdi cənnətin xəznədarı,
Atdı altı qapılı hücrəsinə o varı[3].
Hər nemət onunkudur, yemək-içmək sənindir,
Tarla onun, dən onun, yalnız biçmək sənindir.
Udu yaxıb-yandıran buxurdanın gözüdür,
Yüklə ulaq inlədən palançının özüdür.
Əzəl gündən hər işin sənsiz düşüb yoluna,
Nə mərhəmət görmüsən, özün şahidsən buna.
Yazdagül dəryasında gültək üzən gəmi ol,
Demirəm tikan kimi sükutun həmdəmi ol!
Xəzan vaxtı yelkən aç könül ümmanında sən,
Qorxu-təlaş kürəsi qalama canında sən[4]...
Gövhər kimi saf insan zərif olur cahanda,

[1] Biabırçılıqdan Sərəndibə-Seylona qaçıb orada onun günahından solmuş ismət gülünü tövbə ilə suladı. Sərəndibə qaçarkən günahdan qaralmış üzünün qarasını orada yerə tökdü. Dini əsatirə görə, hindli və seylonluların üzləri həmin səbəbdən qaradır.

[2] Dini əsatirə görə, Adəm Hindistanda qırx il göy paltar geyib tövbə edərək o qədər gözyaşı tökdü ki, nəhayət, fələyin fəlakəti ondan uzaqlaşdı və onun ayaqları altında göy otlar bitdi.

[3] Dini əsatirə görə, Adəm cənnətdə olarkən oranın xəzinədarı güllərin, meyvə ağaclarının və başqa bitkilərin toxumunu ona vermişdi, o isə yer üzünə gələndən sonra o toxumların hamısını çöllərə səpdi.

[4] Cavanlıqda bahar dalğalarında gül gəmisi olub xoş niyyətlə qabağa şığı, qocalıq — ömrünün xəzanı yaxınlaşarkən isə cürətli ol və qorxusuz ölümə doğru get, çünki sən tikan kimi həyat bostanına sancılıb qalsan da gec-tez səni mətbəxdə yandırıb külünün üstünə su tökəcəklər.

İnsan nəyə gərəkdir təlaşı yoxsa canda?
Külək zirək olmasa dolanarmı çəməni?
Qaf dağından ağırsan, ətalət basıb səni[1].
Tikan kimi güllərə uymağın daha bəsdir,
Bənövşə tək hüsnünə boylanmağın əbəsdir.
Bu dünyanın sarayı güzgüdür başdan-başa,
Öz gözün öz hüsnünə hər an eylər tamaşa[2].
Öz əksinə vurulma, bil ki, nədir varlığın,
Qüdrətin güzgüsündə bir zərrədir varlığın...

## ÜMİDSİZ ŞAHIN GÜNAHININ BAĞIŞLANMASI

Röya aləmindəydi bir ədalətli padşah,
Gözlərinə göründü bir ədavətli padşah.
Dedi: "Tanrı qənimdi necə, nəydi cəzası?
Haqsızlıq günlərinə gecə nəydi cəzası?"
Zalım padşah danışdı: "Göz yumanda həyata,
Son dəfə göz dikəndə bu sonsuz kainata,
Ümid işığı gəzdim, söndü ümid məşəlim,
Hər ətəkdən yapışdım, üzüldü kömək əlim.
Halıma yanan kimdi, bir mərhəmət görmədim,
Heç kimdə insaf-mürvət, bir kəramət görmədim.
Söyüd kimi əsdirdi varlığımı bu halət,
Oldum ümidsizlikdən üzüqara, xəcalət.
Fəlakət girdabında boğulanda bu canım,
Bir tanrıya güvəndim, ona gəldi gümanım:
Ulu tanrı, yanında xəcalətəm mən sənin,
Günahını bağışla üzüqara bəndənin.
Hökmünə, fərmanına baxmamışam çox zaman,
Aman yoxdur kimsədən, özün aman ver, aman!
Ya cəza tonqalında yanmağa göndər məni,
Ya da mərhəmətinlə bəndəyə döndər məni.
Hamıdan xəcalətli, kimsəsizcə bir kəsi,

[1] Külək yüngül ruhlu olduğu üçün həmişə hərəkətdə, sən isə Qa dağından ağırcan olduğun üçün yerindən tərpənib ülvi amallara xid edə bilmirsən.

[2] Bu dünyanın evi güzgü kimi sığallı olduğu üçün hər yerdən görü sənin gözlərin isə yalnız öz üzünə baxmaqla məşğuldur.



Bağışladı insaflı kimsəsizlər kimsəsi.
Mərhəmətə gətirdi yalvarışım, diləyim,
Zəlillik torpağında qoymadı ki, inləyim".
Kimin ki, peşmanlıqdır hər nəfəsi, hər ünü,
Qiyamətdə darğadır qovğalı məhşər günü.
Ömür boyu aldığın hər bir nəfəs ki, vardır,
Əzabına — tərəzi, həyatına — dağardır.
Dağarı gəzdirməkdə, söylə, nədir qərəzin,
Ömrünün illərini ölçə bilsin tərəzin?!
Tərəzinin daşları, daş-qaşların olacaq?
Boş qalan dağarına göz yaşların dolacaq.
Həyat tərəzisini düz çəkməz yerin daşı,
Qoluna gil muncuğu taxan naşıdır, naşı!..
Yetimin göz yaşları ətəyinə axmasın,
Ağbirçəyin fəryadı səni oda yaxmasın.
Çürümüş köhnə fərşi gəl eylə ələk-vələk,
Gərdişini dəyişsin sinəsi dağlı fələk.
Ya kimsəsiz qərib tək intizarla köks ötür,
Ya da Nizami kimi bu dünyadan əl götür.

### İKİNCİ SÖHBƏT

## ƏDALƏTLİ VƏ İNSAFLI OLMAQ HAQQINDA ŞAHA NƏSİHƏT

Sən, ey canlı aləmə bəxtiyarlıq gətirən!
Gövhər taclı şahları şan-şöhrətə yetirən!
Şahsan, şah cəlalınla nurlar ələ gözə sən,
Gövhərsən, ülviyyətin öz tacını bəzə sən...
Müqəddəs mehrabındır fələk durub keşikdə,
Səni öz körpəsitək yürgüləyir beşikdə.
Sənsən könül quşu da, İsanın nəfəsi də,
Bəşərin öz hüsnü də, eşqi də, həvəsi də.
Camalını görüb ki, belə şadlanır günəş,
Eşqinin atəşiylə yanıb odlanır günəş.
Telinin həsrətindən canı üzülər ayın,
Görsə nurlu üzünü çöhrəsi gülər ayın...
Məslək, inam, dəyanət gərək hər bir insana,

Sədaqəti töhfətək verək hər bir insana,
Məslək eşqiylə yanan qəlb ki, vardır həyatda,
Dünyanın o başından xəbərdardır həyatda.
Məslək ilə sənindir ölkə də, bu cahan da,
Bəxtiyarsan onunla bəlkə də bu cahanda.
Dünyanı məslək ilə almaq asandır, asan,
Azğın divin məkrinə gərək aldanmayasan.
Kəhrəbaca məsləki kimin deyildir bəsi?
Bircə batman qızıldır inamın hər zərrəsi.
Sərvətin qara torpaq, bir qara daşdı sənə,
Məsləkin həm qızıldı, həm də qaş-daşdı sənə.
Sənə nemət verən kəs hər qayğına qalandı,
Bir verib on alarmı, on verib bir alandı.
Məsləkindən savayı, bil ki, yoxdu qazancın,
Əgər varsa məsləkin, demək çoxdu qazancın.
Dözümü, yumşaqlığı, təmkini yerdən öyrən,
Hər şeydən vaz keçməyi əsən yellərdən öyrən.
Şahlıq verən buyurub: tut bu məslək yolunu,
Ədalət sahibləri tutdu məslək yolunu.
Məsləhətə möhtacdır ədalət hər bir zaman,
Xalqa zülmün amansız cəzasından dad, aman...
Dünyaya fateh olmaz zülmkarlıq, rəzalət,
Yer üzünün fatehi ədalətdir, ədalət!
Ədalətli-müjdəçi, bu dünyanı şad eylər,
Ədalətin işidir, — ölkəni abad eylər.
Məmləkətin dayağı ədalətdir hər zaman,
Ədalətlə nəsibin səadətdir hər zaman.

## NUŞİRƏVANLA VƏZİRİ VƏ BAYQUŞLARIN SÖHBƏTİ

Nuşirəvan qoşunla çıxmışdı bir gün ova,
Ayrıldı dəstəsindən atla ov qova-qova.
Şahın yaxın həmdəmi artıq yalnız vəzirdi,
Hər ikisi at çapıb, ovlaqda ov gəzirdi.
Çatdı düşmən qəlbitək virana bir yurda şah,
Tapardı axtardığı hər şikarı burda şah.
İki bayquş səs-səsə verərək ulayırdı,
Qəlbləri şah qəlbitək nəsə "arzulayırdı".



Şah soruşdu vəzirdən: "Nə danışır bu quşlar?"
Bir-birinə nə deyir, nə söyləyir bayquşlar?"
Vəzir cavab verdi ki: "Zamana şahsan özün,
Hər hikmətdən, hər sirdən çoxdan agahsan özün.
Səsləri nə müsibət, fəlakət salmır yada?
Nikah-kəbin, cer-cehiz söhbəti var arada.
Bu quş onun oğluna ərə verir qızını,
İndi başlıq istəyir işə salıb ağzını:
"Bu xaraba kənd nədir, bir qıza azdır", deyir,
"Kəbin haqqı" bir neçə xaraba yazdır", deyir.
Elçi gələn quş deyir: "Şərikəm hər sözünə,
Şahın zülmkarlığı bəllidir yer üzünə.
Qanlar tökən görürəm şahı gündə yenə mən,
Yüz min belə xaraba kənd verərəm sənə mən".
Bu sözlər atəş kimi yandırdı, yaxdı şahı,
Elə fəğan qopardı göylərə qalxdı ahı.
Ağladı, ikiəlli qapaz saldı başına,
Nahaq qanlar zalımı qərq edər göz yaşına.
Zülmünü yada salıb, dişlədi barmağını:
Quşlar da eşidibdir zülmümün sorağını...
Mis deyil, qızıl sikkə nəsib olub adıma.
Bu qədər haqsızlıqla haq çatarmı dadıma?!
Zülmkartək tanınım eldə, obada niyə?
Ömrü zülmkarlıqla verim mən bada, niyə?
İndən belə qəlbimdə mərhəmət olsun gərək,
Tanrıya, ya özümə hər hörmət olsun gərək.
Haqsızlığın həddini lap aşmışam daha mən,
El gözündə dönəcəm ən yaramaz şaha mən.
Yanmalıyam, yanmalı, gör kimə yanır qəlbim?!
Qiyamətdə yanacaq qəlbimə yanır qəlbim.
Qılıncımla elləri biçməyim bəsdir daha,
Alçalıb, insan qanı içməyim bəsdir daha.
Talançıyam, fəxr edib öyəcəyəm özümü?
Qiyamətdə sorsalar, döyəcəyəm gözümü.
Xəcalətəm, mümkünmü daha şadlana qəlbim?
Daş qəlbliyəm, mümkünmü dönməsin qana qəlbim?
Qaxıncam, nalə, fəryad qopardığım budur, bu!
Qiyamətə özümlə apardığım budur, bu!
Öz köhlənim özümü tapdayacaq orada,

Can zülmün cəzasına tablayacaq orada[1]?
Saysız xəznə yığmışdı qılıncının zoruna,
Ondan Samla Firidun nə apardı goruna?
Dünyaca var-dövlətim sayılarmı dünyada?
Dünyadan apardığım bir şey varmı dünyada?"
Şah bir odlu məşəldi, yandı yalı köhlənin,
Nəfəsindən əridi polad nalı köhlənin.
Şahanə dəbdəbəylə sarayına yetişdi,
Şəfqətilə hamının harayına yetişdi.
Bir yolluq qələm çəkdi bac-xəracın üstündən,
Son qoydu haqsızlığa, ellər çıxdı pis gündən.
Ədalət göstərərək atdı sitəmkarlığı,
Ömürlük arzusuydu elin bəxtiyarlığı.
Taleyin imtahanı canını alan oldu,
Ədaləti dünyada əbədi qalan oldu.
Ülviyyət aləmində yenə də şahdır özü,
Şan-şöhrət sikkəsinə yazıldı "adil" sözü.
Bəxtiyar hökmdardı, tarixdə qaldı adı,
Kim ki adil şah oldu, belə ucaldı adı.
Hər ürəyi sevindir, xürrəm yaşa dünyada,
Tanrı qoymaz ki, dəysin oxun daşa dünyada.
Günəşi oyadanlar xoşbəxt olsun sayəndə,
Dosta səadət olsun fikrin, zikrin, qayən də...
Ülviyyətə qulluq et, günah dalınca varma,
Günahkar insan kimi boyun büküb yalvarma.
Ömür keçib gedəndi, dünya qalandı sənə?
Ülviyyətə sədaqət şərəfdi, şandı sənə.
Hər üzrün, yalvarışın — hiylə, kələk, aldanış,
Quru sözdən nə çıxar? İşdən, əməldən danış.
İşlər sözlə düzəlsə, hər iş də düz gələrdi,
Nizami hünəriylə göylərə yüksələrdi.

[1] Yəni mənim rahatlığım üçün zəhmətə qatlaşıb əziyyətimi çəkən, yükümü gəzdirən rəiyyətim, o dünyada mənə ağır yük olacaq. Çünki ona etdiyim zülm üçün cavab verməliyəm. Bu dünyada mənə kömək olub, bütün müşkül işlərimə çarə tapan xalq məni biçarə edəcək, çünki onlara verdiyim əzab və əziyyətə cavabdehəm.





## DÜNYANIN KEŞMƏKEŞİ VƏ BƏŞƏRİN İZTİRABLARI

Yerə, göyə sığmayan ey həşəmət ağası!
Olma bir an cahana etinasız baxası!
İztirabın, əzabın edər üzüağ səni,
İstərəm ehtişamdan mən görüm uzaq səni.
Son gününü unutma, ömrün boyu sal yada,
Möhtəşəmlik ağası yoxsulluqdur dünyada.
Süleymanın mülkünü sorma hər an hardadır?
Mülkü öz yerindədir, de Süleyman hardadır?
Vamiq — toylu, büsatlı sadiq yardı cahanda,
Əzra — nazlı gəlindi, bir nigardı cahanda.
O toy, gəlin otağı indi hardadır, harda?
Vamiq, Əzra hardadır? Məzardadır, məzarda!...
Zümrüd quşu bəsləyən Sam oğlu Zaldı bəşər,
Dünya-Samdır, qocalmaz, Zaltək qocaldı bəşər[1].
Öz çarxını tərsinə çox dolandırır fələk,
Ədasıyla qəlbini yaxıb-yandırır fələk.
Gah ucaldır canlının şahlığı ilə səni,
Gah döndərir kuzəçi əlində gilə səni.
İki rəngli fərşə ki, ayaq qoyubdu varlıq,
Həyatından bezardı, cana doyubdu varlıq.
Səhrada həyat sürən deyinər biixtiyar:
"Dəryalar qoynundakı bəxtiyardı, bəxtiyar!"
Dəryadakı darıxar, naləsi qalxar göyə,
Xiffətindən qovrular "səhra gözəldir" deyə.
Keşməkeşli həyatı fəlakətdir insana,
Hər yerdə narahatlıq bir adətdir insana.
Köç yükünü karvana çatmalıyıq, çatmalı!
Bu yurdu, xanimanı atmalıyıq, atmalı!

[1] Biz cahanın törəmələriyik və o, həmişə bizim cavanlığımızı əlimizdən alıb bizi qocaldır, özü isə daima cavan qalır. Bunda nə hikmət var? "Şahnamə"nin əsas qəhrəmanlarından biri Rüstəmin atası Zal anadan olanda saçı ağ idi. Atası Sam bu saç ağlığını fəlakət rəmzi hesab edir. Oğlunu dağın başından atır. Əfsanəvi xeyirxahlıq rəmzi olan Simürğ (Zümrüd) quşu Zalı götürüb bəsləyir və həmişə ona yardım göstərir. Şair dünyanı saçları qara cavan Sama, oğlu ağsaç Zalı isə insanlara bənzədir.

Karvana qoşulmayan düşəcək bəndə, demək,
Şəhərdən sürgün olar ən ucqar kəndə, demək[1].
Əldən düşən yolçunun, bil, hədərdir yolu da,
Yoxluqla arasında tük qədərdir yolu da.
Uyma vara, dövlətə, təkəbbürdən uzaq gəz,
Zülmət ömür yoluna günəş nuru çiləməz...
Vermə təlim aldığın ariflərə macal sən,
Bəxtiyar insanlara arxalanıb ucal sən.
Gülün şirin vüsalı nəsib olar tikanə.
Gülün özü solsa da ətri dolar tikanə[2].
Məhşərdə oxunanda guya cəza fərmanı,
Sorğu-sual etməyə gətirirlər səhranı.
Deyirlər: "Sən qanını içmisən heyvanların,
Təşnəsisən tökülən, axan nahaq qanların,
Yoxsa, dirilik suyu həyat verməz qumuna,
Səhrasan, Fərat nəhri axıb gəlməz şumuna"[3]...
Yaxşı insan qalmayıbdır, şər şərə yaraşıbdır,
Dünya bal süfrəsidir, arılar daraşıbdır.
Dövrə bax ki, alçalıb zülmdən, şərdən bəşər,
Azğınlığın əlindən qaçır bəşərdən bəşər.
İnsanda nə ləyaqət, nə mərdlik qalıb indi,
İnsandan insanlığı namərdlik alıb indi.
Çoxdan yoxa çıxıbdı ədalətli Süleyman,
Haqsızlıqdan görünməz pəriyə dönüb insan[4].
Kimə ki, insan kimi dərdimi açmışam mən,
Namərdliyi ucundan üzündən qaçmışam mən.

[1] Bu həyat karvanının hərəkət dairəsindən kim kənara çıxıb yolda qalıbsa, o, cavanlıq, gümrahlıq şəhərindən xaric edilib, qocalıq, acizlik kəndinə sürgün olunubdur. O kənddə ona nə qədər aman verilsə də, yoxluq onu uzaqdan nişan verir və bilir ki, geci-tezi oraya gedəcəkdir.

[2] Qədim şəhərlərin birində deyilir ki, gül bağlarında bir növ tikan olur, sünbül çiçəyinin kökünü o tikana sarıyıb bir müddət saxlayandan sonra sünbül çiçəyi qaliyə ətri saçmağa başlayır.

[3] Qiyamət günü səhranı ortaya çıxarıb ondan hesabat tələb edərək soraçaqlar: "Ay cani, sənin sinəndə çağlayan çeşmələr ürəyi yaralı biçarələrin və dili, ağzı bağlı heyvanların ciyər qanıdır, sən onların ciyər qanını sorMusan, yoxsa bu qumlu səhra hara və dirilik suyuna bənzər bulaqlar hara?".

[4] Süleyman peyğəmbərin ədalətli, insanpərvərlik və pak zəmanəsi gedib, indi isə zülm, əsarət, qəddarlıq dövranı hökm sürür və buna görə də əsl adam, həqiqi insan pərilər kimi gözə görünmür.



Kimsənin kölgəsində səadət görməmişəm,
Əhdə dönük insanda sədaqət görməmişəm.
Hikmət dəni səpdim ki, vəfa dəni cücərsin,
Hamı alqış oxuyub, bir gün barını dərsin.
Toxumu şuma səpib becərər əkinçilər,
Vaxt gələr əkdiyindən bar dərər əkinçilər...

## SÜLEYMAN VƏ QOCA ƏKİNÇİ

Günlərin bir günündə seyrə çıxdı elindən,
Söndü sübhün çırağı Süleymanın yelindən.
Ölkəsi boyda taxtı-küləyi uçdu onun;
Həşəmətli taxtını bir səhra qucdu onun.
Qoca əkinçi gördü-həmdəmi biyabandı,
Süleymanın ürəyi onun halına yandı:
Bircə ovuc dəni də kəsib yoxsul daxmadan,
Səpib kərəm mülkünə ehtiyaca baxmadan.
Yoxdu dən səpmədiyi bircə qarış yer belə,
Sünbüllər oynadıqca qarışırdı tel-telə.
Əkinçi bəbəyitək bəsləyirdi hər dəni,
Süleyman quşlarını səsləyirdi hər dəni.
Süleyman söylədi ki:"Tamahlanma, ay qoca,
Nemətini, ruzini gəl eyləmə zay, qoca.
Tor-cələ qurmamısan, dən səpirsən quşlara,
Quş dilində danışma, bələdəm mən quşlara"[1].
Belin yox, quru əllə yer təpməyə gəlmisən?
Suyun yox, kəndli kimi dən səpməyə gəlmisən?
Əkin-səpin üstündə suyumuz boldu bizim.
Qismətimiz gül əkib, vay dərmək oldu bizim.
İsti dəni qovurur alovlanan tarlada,
Məhsul ələ gələrmi, susuz yanan tarlada?
Qoca dedi: İncimə, qoy deyim sözümü mən,
Nə suya, nə torpağa dikmişəm gözümü mən.
Halal zəhmət itməyib, əlləşmək deyil eyib,
Tanrı: "Səndən hərəkət, məndən bərəkət" deyib.
Kürəyimin təridir — mənim suyum, səlim də,
Bu dəmir dırnağımdır xış əvəzi belim də.

[1] Quş dilində danışmaq — mənasız, boş-boş danışmaq.

Şah deyiləm məmləkət dərdi çəkib yaxılım,
Ömrü boyu şadam ki, vardır dənim, taxılım.
Bolluğun müjdəsini bu göylərdən alıram,
Hər dənin sünbülündən yeddi yüz dən alıram.
Şeytan ilə şərikli əkməsəm əgər dəni,
Dən dolu sünbüllərim torpağa əyər dəni"...
Xoşbəxt odur dözümə ləyaqəti var onun,
Ağır yükə qatlaşmaq dəyanəti var onun.
Naz çəkmədən saralıb solan azdı dünyada,
Qarnı sirr dağarcığı olan azdı dünyada.
Çox uzatma mətləbi yanıb-yanıb Nizami,
Naz çəkməyə dünyada tək yaranıb Nizami.

DÖRDÜNCÜ SÖHBƏT

## HÖKMDARIN XALQA QAYĞISI VƏ ƏDALƏTİ

Ey mərdlik qalxanını atıb diz çökən insan!
Qəflət divi azğınlıq yoluna çəkən insan!
Güvənirsən şahlığa, şahlıq gəldi-gedərdi,
Güvənirsən həyata, həyatın da hədərdi.
Eyş-işrətlə vurursan öz ömrünü sona sən,
Fələk qatıb başını, oyuncaqsan ona sən.
Quranı, qılıncını bir kənara atmısan,
Əlində cam, sürahi nəşəylə baş qatmısan.
Nə güzgün, nə darağın bir an əldən düşəndir,
Gözəl-göyçək qadıntək sığallanmaq peşəndir.
Rabiyə olmasaydı xilaskarı, köməyi,
Susuzluq təşnə düzdə öldürərdü köpəyi[1].
İgidsənsə, kişilik adından utan barı,
Ərsiz hünər göstərən qadından utan barı...
Sən ki, fələk deyilsən cəza hökmü yazırsan,
Cəza hökmü yazmaqla hər cəzaya hazırsan.
Ədalətin ucaltsın qoy nəslinin adını,

[1] Rabiyə Bəsrəli bir gün səhrada bir itin susuzluqdan can verdiyini görüb hörüklərini kəsib paltarını da ona bağlayıb quyuya salır. Sonra o, paltarını sıxaraq itə su verir və onu ölümdən xilas edir. Bu hərəkətinə görə bu mömin qadın övliyə zümrəsinə daxil edilir.



El gözündən salmasın özünü, övladını.
Haqsızlığa uyaraq günaha batmaq nədir?
Qan töküb, zalım olub, abrını atmaq nədir?
Bundan əzəl öyündün, qılıncını şaxıtdın,
Neçə igid öldürüb, nahaq qanlar axıtdın.
El gücü-sel gücüdür, hər an çəkin bu seldən,
Yataqda da can alar qisas oxu qəfildən.
Xalqa divan tutanı divan gözlər hər yanda,
Məzlumların fəryadı qorxuludur cahanda.
Hindli ərlər vermədi canlarını sadağa,
Saldı Sultan Mahmudun sağ canını yatağa[1].
Xalq intiqam fikrindən çox çətin ki, daşına,
Nə müsibət gətirər, qisas sənin başına.
Məslək əri həmdəmdi mələklərin özüylə,
Yumurtaya can verər tısbağa öz gözüylə[2].
Qılınc çəkib yerimə məzlum kəsin üstünə,
Hər səhər qarğış oxu tökülməsin üstünə.
Dünya özü zalımdır, zülm eləyir varlığa,
Ədalət hakimiylə qalıb hökmdarlığa.
Kim ki zülmün evini bərbad edib indidən,
Öz sabahkı evini abad edib indidən.

## QARI VƏ SULTAN SƏNCƏR DASTANI

Haqsızlığın odunda bir qarı yandı oda,
Səncərin ətəyindən yapışdı bir gün o da:
"Zülm əlindən qalmışam mən zarıya-zarıya,
Zülmün divan tutdurur bir köməksiz qarıya.
Kefli-kefli qapımın ağzını kəsdi darğan,

[1] Sultan Mahmud Qəznəvi Hindistanı fəth edəndən sonra hind kahin və yoqları öz maqnetizmi vasitəsilə Mahmudu dəhşətli xəstəliyə mübtəla edirlər. Bu zaman Mahmuda xəbər çatır ki, onun xəstəliyinin səbəbi kahin və yoqların dua və ibadətidir. Mahmud onları məcbur edir ki, onun şəfa tapması üçün dua oxusunlar. O bundan sonra sağalır.

[2] Su tısbağası sahildə yumurtlayır, yumurtalarını quma basdırır. Allahın kəraminə ümid edərək yenə dənizə qayıdır.

Yumurtalar qumda cücərir, müəyyən müddətdən sonra tısbağa balaları çıxıb özləri dənizə gedirlər.

Beytin mənası: Su tısbağasının kəşf edə bilmədiyi Allah mərhəmətinə insanlar da yol tapıb onun qəzəbini zülmkarların əleyhinə yönəldəcəkdir.

Təpiklədi doyunca, o ki var əzdi darğan.
Bir günahım olmadan çölə atdı daxmadan,
Sürüklədi saçımdan fəryadıma baxmadan.
Mən zülmün zindanında qansız gördüm yağını,
Ürəyimə, canıma basdı zülmün dağını".
Dedi: "Ey qozbel qarı, söylə, filan gecədə,
Filankəsi öldürən kimdi sizin küçədə?"
Evimi çox axtardı, qatil hardadır, — deyə,
Bu müsibət, həqarət sığarmı yerə, göyə?
Darğan sərxoşluq edir, el-obada qan olur,
Bir günahsız qarıya dözülməz divan olur.
Əyyaşlıqla soyurlar el varını darğalar,
Divana da çəkirlər bir qarını darğalar.
Bu zülmə, haqsızlığa dözmək çətindir-çətin,
Mənim abrım tapdanır, səninsə ədalətin.
Bu yaralı sinəmdə əzilməmiş yer hanı?
Ruhum uçub bədəndən, tapşırıram bu canı.
Sən dadıma çatmasan, şah dimərəm adına,
Qiyamətin günündə çatmasınlar dadına.
"Dad, aman" — deyə-deyə qalan görüm səni mən,
Zülmünün cəzasını alan görüm səni mən.
Hər elin hökmdarı el dərdinə qalandı,
Zülmün hara çatıb ki, var yoxumuz talandı.
Yetimlərin malını talamaqdı işin də,
Abxazları soymusan, şirə qalıb dişində[1].
Qarıların nəyi var, quldurluqdan sən utan!
Utan, utan onların ağ birçəyindən utan!
"Şaham" deyib öyünmə, sən ki, qulsan tamaha,
Viran qoydun elləri, şah olmaz səndən daha.
Şah elin hər işini nizama salsın gərək,
Həmişə öz xalqının qeydinə qalsın gərək.
Hökmünə, fərmanına baş əyər hamı onda,
Sevib, sonsuz məhəbbət bəsləyər hamı onda.
Aləmi alt-üst edib, talamısan elləri,
Xalqa xeyrin dəyibmi şah olan gündən bəri?...
Xoş sözündən sevinsin ağbirçəkli qadın da,
Ağbirçəyin sözünü yaxşı saxla yadında:

[1] 1139-cu ilin sentyabr ayında Gəncədə baş verən fəlakətli zəlzələdən sonra Gürcüstan çarı Gəncəyə hücum çəkərək şəhəri qarət etmişdir.



"Zavallı məzlumların var-yoxunu talama,
Dərdlilərin oxunu öz sinənə qalama.
Künc-bucaqda qalana sən bu qədər atma ox,
Yoxsulların ahından, qarğışından çəkin, qorx!
Səadət qapısını açmağa yaranmısan,
Sanma sitəm dalınca qaçmağa yaranmısan.
Hökmdar olmusan ki, yetişəsən haraya,
Daim məlhəm qoyasan, hər sızlayan yaraya.
Məzlumlar güvənirlər şöhrətinə, adına,
Sən də yetiş onların köməyinə, dadına.
Nəfəs dərən sailin nəfəsini dinlə sən,
Dünyadan bezənləri süzmə gendən kinlə sən.
Qoy səltənət mülkündə əsməsin qara yellər,
Qoy kəramət tacını başında görsün ellər".
Xorasanda Səncərin zülmü elə car oldu,
Eşitmədi bunları, bəlaya düçar oldu.
İnsan indi taparmı, arasa ədaləti?
Zümrüd quşu aparıb, harasa ədaləti[1].
Haqsızlıq arsız göyü heyran qoyubdur indi,
Torpaq zülmün əlindən cana doyubdur indi.
Nizami, etirazın həddini aşdı yenə,
Qana dönmüş qəlbində qan seli daşdı yenə.

BEŞİNCİ SÖHBƏT

## BƏŞƏRİN DÜŞGÜNLÜYÜ VƏ KEŞMƏKEŞLİ HƏYATI

Gənclik — nurlu səhərdi, qocalıq — qərib axşam,
Biri parlaq günəşdi, biri öləyizəyən şam.
Uymusan səhərlər də şirin-şirin yatmağa,
Ömrünün al günəşi üz qoyubdu batmağa.
Dünyanın sevdasını gəzdirmə başında sən,
Cavanlıqdan əl götür, ixtiyar yaşında sən.
Gözəllərin eşqindən yaralısan, yaralı,
Sevdalı aşiqlikdən aralısan, aralı.

[1] Bizim zəmanəmizdə ədalətdən əsər yoxdur, o, dağlara qaçıb Zümrüd quşunun qanadları altında özünə yer tapıbdır.

Ağlı heyrət bürüyüb, fikrin alt-üstdü daha,
Əlin qabar-qabardı, ayağın süstdü daha.
Başına nazbalışdır öz qucağı torpağın,
Rahatlıq guşəsidir hər bucağı torpağın.
Dünya gözəl olsa da bitməz narahatlığı,
Hər əzaba son qoyar əbədi rahatlığı.
Hüsnün aylı çeşməydi, o çeşmə donub indi,
Lalətək yanağına sarılıq qonub indi
Tərazlı tək gözəldin, saçın həbəş saçıydı,
Hüsnün türkə, ərəbə bir elin xəracıydı[1]...
Cavanlığın qədrini bilərsən qocalanda,
İtən ömrə göz yaşı çilərsən qocalanda.
Cavan ağac hər bağın gözəlidir, gözəli,
Qocaldımı, sındırar onu bağbanın əli.
Cavanlıq od-alovdur, gözəlliyin tacıdır,
Cavanlıq çox şirindir, qocalıq çox acıdır.
Tər budağın üstündə təzə açan gül olar,
Quru odun ocaqda yana-yana kül olar.
Ənbər saçan şəvədir hər bir başın qarası,
Saf qızıla məhəkdir, bil ki, daşın qarası.
Gəncliyi vurdun başa, qəflətdən oyan indi,
Al günəşi oyatmaz yuxudan doyan indi.
Şam kimi ərimisən, gücün yox aha sənin,
Müşk ətirli saçına qar yağıb daha sənin.
Havalar soyuyanda qısılar otlar yerə,
Ağappaq qar ələyər qara buludlar yerə.
Fələk — boyaq küpüdür, sanma boyası azdır,
İsa bir boyaqçıdır, Günəş də ki, rəngsazdır[2].
Buludlar paltaryuyan, Ay-gümüşü ləyəndir,
Gecənin saçlarına məhtab nur ələyəndir.
Yuyub nur çeşməsində öz pasını asiman,
İsaya boyadıbdır libasını asiman.
Zərrə qədər boyası, rəngi varmı havanın?
Tutqunluğu könüllər oxşayarmı havanın?

[1] Bu beytdən belə məlum olur ki, şair 30 yaşlarında ikən saçına və saqqalına dən düşüb, çallaşmağa başlayıb.
[2] Beytin məzmunu belədir: İnsanın saçları istər qara, istərsə də ağ olsun, ikisi də bir şeydir. Biri cavanlığın hesabına qara, birisi isə zəmanənin sel-sularında yuyularaq ağ olmuşdur.



Gündüz kimi ağappaq, gecə kimi qapqara,
Ağ rumlu, qara zənci olmaq hara, sən hara[1]?...
Təzadlı aləminə, söylə, nəzər salırsan?
Yayda cübbə geyirsən, qışda üryan qalırsan[2].
Şir, pələng ovla yaşar, libasıdır dərisi,
Tapdağıyla dolanan olmaz tamah hərisi.
Varsa suyun, çörəyin yoxluqdan qəmə batma,
Əlini çömçə təki hər kasaya uzatma.
Çörək də söndürməsə hərisliyin odunu,
İç içməli sulardan, döşür yemlik otunu...
Qana qəltan etsə də səni zəhmət tikanı,
Çalışmaqdan usanma, işə alışdır canı.
Öz halal zəhmətinlə namuslu insan sayıl,
Hər yetənə alçalma, əl açıb olma sail.

## KƏRPİCKƏSƏN QOCANIN BİR CAVANLA HEKAYƏTİ

Deyirlər Şam tərəfdə bir qoca kişi vardı,
Pəri kimi xalq ilə onun nə işi vardı.
Əyninin köynəyini ot-ələfdən hörərdi,
Kərpic kəsib bir təhər dolanar, gün görərdi...
Qılınclı ərlərin ki, düşərdi qalxanları,
Məzarına kərpicdən döşərdi "qalxanları".
Kəfənsizin kəfəni, duvağıydı kərpici,
Günahkarın ağzının suvağıydı kərpici.
Bir gün yenə işiylə başını qatdı qoca,
Əldən-dildən düşərək qan-tərə batdı qoca.
Birdən-birə göründü gözə bir cavan oğlan,
Başladı məzəmmətlə sözə bu cavan oğlan:
"Bu düşkünlük, zəlillik səncə, hara yaraşar?
Palçıq-saman yoğurmaq muzdurlara yaraşar.
Torpağın qalxanını qılıncınla sökmə sən[1],

[1] Nə qədər ki, zənciyə bənzər gecə və rumluya bənzər ağ gündüz kimi ikiüzlüsən, cəhalət və zülmətdən çıxa bilməyəcəksən.
[2] Ağaclar yayda zərif çiçəklərdən ağ kətan köynək geyir, qışda isə o köynəyi atıb qaba palaza bənzər qabıqda qalır. Sənin bu ikiüzlü və ikirəngli təbiətinin nəticəsində cavanlıqda bərli-bəzəkli olursan, qocalanda isə çılpaq qalırsan.

Bir qarın çörək üçün öz abrını tökmə sən.
Bu kərpic qəlibini yandırıb külə döndər,
Ömrün xəzan bağını əlinlə gülə döndər.
Daş kimi kəltənlərə bel vurmaqdan nə çıxar?
Bəlimli palçıqları yoğurmaqdan nə çıxar?
Qocasan, qocaların yerişini yeri sən,
Yorularsan, cavanın yerişini yerisən".
Qoca dedi: "Nadanlıq havası var başında,
Ağsaqqala gülürsən belə cavan yaşında.
Qocalar kərpic kəsər, halallıqla yaşayar,
Kölələr, əsir qullar ağır yüklər daşıyar[2].
Qarşında boyun büküb əl açmayım deyə mən,
Əzəldən əl atmışam belə bir peşəyə mən.
Nə xəzinə yığanam, nə də tirmə geyənəm,
Öz halal zəhmətimin çörəyini yeyənəm.
Halalca nemətimə naşükür olma mənim,
Nemətə xor baxana nemət qənimdir, qənim".
Qocaya tənə vuran peşmanladı sözündən,
Gözdən itən zamanda yaş axıtdı gözündən.
Dünya görmüş insandı, qoca belə qocaydı,
Namuslu zəhmətiylə el gözündə ucaydı.
Unut dünya evini sən burada, Nizami!
Məslək eşqi yetirər hər murada, Nizami!

## ALTINCI SÖHBƏT

## VARLIĞIN QÜDRƏTİ

Bu sehirli pərdədə möcüzə göstərən var,
Sehrkar qüdrətiylə ecazkardır, ecazkar.
Qəlbinin gözləriylə seyrə dal bu pərdəni,
Gördüyün hər möcüzə hər an sehirlər səni.
Qubarlı pərdədəki quldurlar gəlməz saya,
Keşikçidir fələyə, talançıdır dünyaya.

[1] Burada yer səthi qalxana, bel isə qılınca bənzədilib.
[2] Yəni nəfs, acgözlük, şəhvət və ehtirasların əsirləri minnət götürmə-yə, başqalarının yükünü daşımağa qadirdirlər, mən isə öz zəhmətimin bəhəri ilə dolanıram.



Köləlik ziyasıdır gözlərinin gövhəri,
Könülün köləsidir onlar əzəldən bəri.
Ətalətdən uzaqdır gərdişi kainatın,
Varlığa həvalədir hər işi kainatın.
Fələyin köhlənləri yəhərlidir əzəldən[1],
Yalmanına yatmayan qəhərlidir əzəldən.
Bu cavan, hərəkətli qoca fələkdən qabaq,
Ululuq şan-şöhrəti uca fələkdən qabaq.
Əlimizlə qurmuşuq eşqin uca taxtını,
Eşq ilə sınamışıq insanlığın baxtını.
Xeyrin, şərin yükündən insan çətin daşına,
Şikar kimi bağlanıb yəhərinin qaşına.
Dünya sirli saraydır, sirdaş da sənsən ona,
Torpaq acgöz bir quşdur, ən gözəl dənsən ona.
Xilas eylə canını sinə sökən bu quşdan,
Zümrüd kimi havalan, görünməz ol uçuşdan[2].
Qəfəsdəki can quşun İsa deyil, bəs nədir?
Yerdə qanad açsa da, məskəni göylərdədir[3]...
İki dünya yolunda yolçuluğun əbəsdir,
Könülə qovuşmağa yarım nəfəs də bəsdir[4].
Kim varlıq cövhərini bu gildən yaradıbdır,
Ruhunun Kəbəsini könüldən yaradıbdır.
Qalsın tozlu dəridə çirki, pası ruhunun,
İşıqlı könüldədir hər cilası ruhunun.
Sürmə çəkən nəsimdir nərgizin gözlərinə,
Mis iksirlə dönübdür kimyagərin zərinə[5].
Bədənin ovxalanan bir ovuc gildən sənin,
Əzəl gündən sirdaşın yalnız könüldü sənin.
Öz könlünə qul ol ki, sultanlığa çatasan,

[1] Fələklər insanlara və varlığa qulluq etmək üçün yaradılıb.
[2] Quş dəni dənləyən kimi yer səni dənləyib udacaqdır. Odur ki, sən Zümrüd quşu kimi yer üzündə mənəviyyata qulluq etmə, özünü təmkinli apar.
[3] Yəni sənin ruhun sənin cismində yerləşsə də, özü səndən yüksəklərdə durur.
[4] İki aləm arasındakı yol, yəni cisim və canın arasındakı fasilə ikicə mənzildir, ürək üçün yarım addımdır və ürək onu bircə nəfəsə gedə bilər.
[5] Nərgizin gözünə sürmə çəkən səba, misi qızıla çevirən kimya olduğu kimi sənin varlığının da cövhəri ruhun mərkəzi olan qəlbdir, sən qəlbə və onda yerləşən ruha qulluq elə.

Ağla, cana hökm edib köləliyi atasan...
Zəhmət fəryad deyildir, bir şadlıqdır insana,
Zəhmətinin axırı rahatlıqdır insana.
Düşünmə ki, qəsdinə durub haçandır fələk,
Qapılar bağlasa da, qapı açandır fələk.
Çıxar nicat yoluna bir gün karvanı ömrün,
Sevinc qəm darğası tək olar sarvanı ömrün[1].

## OVÇU İLƏ TÜLKÜNÜN HEKAYƏTİ

Bir tuşqul ovçu vardı, quşu göydə vurardı,
Dərə keçib, dağ aşar, bənd-bərədə durardı.
Bir tulası vardı ki, cürəti şir cürəti,
Qaçışına çatmazdı Günəşin də sürəti.
Ən heybətli gərgədan qorxusundan əsərdi,
Maralı aslan dişi xəncər kimi kəsərdi.
Köməyilə vəhşilər bir şikardı ovçuya,
Gərəkliyi hər zaman aşikardı ovçuya.
Hər şikara cumanda qəlbinə nur saçardı,
Gecə keşikçi, gündüz ov dalınca qaçardı.
Şir ürəkli ovçunun şir tulası yox oldu,
Bu itiyin xiffəti ürəyinə ox oldu.
Dedi: "Məni qoruyar, ovumu izləyərdi,
Bir tazımın dırnağı yüz aslana dəyərdi".
Hayıfsınıb əzabdan od tutdu, nə tutdu o,
Dözüb şirin canını öz dişinə tutdu o.
Hövsələ daralanda sanma dözmək asandı.
Zərrə qədər səbriylə sanki dirhəm qazandı.
Bir tülkü yaxınlaşıb ələ saldı ovçunu.
Söylədi: "Nə yaxşı ki, bu dərd aldı ovçunu.
Eşitdim ki, gəbərib o zirək tazın sənin,
Tazın ölüb getsə də, olmasın yasın sənin.
Dünən səndən ayrılıb, şikara cumdu tazın,
Ovdan ötrü həlakdı, gözünü yumdu tazın.
Budur, öz ovçusuna özü şikardır indi,
İki aylıq bolluca yeməyin vardır indi.
Ürəyini kababtək dur, yaxşıca çək şişə,

[1] Misranın məzmunu: Hər kədərin, qəmin arxasınca sevinc və şa[...] gəlir.



Beyni-sənə yem olsun, dərisi-mən "dərvişə".
Əvvəl yağlı yeməyə yaman çoxdu iştahın,
İndi yağlı tülküyə niyə yoxdu iştahın?
Bir gün qan udmalıydın yağımızı yeməkdən,
Sarılıq tutmalıydın yağımızı yeməkdən[1].
Qorxum yoxdur torundan, zəhri yarandan daha,
Qurtarmışam ölümdən, müdhiş yarandan daha.
Artıq uzaq gəzirsən, niyə bizdən bezmisən?
Heç saya da salmırsan, əlimizdən bezmisən?"
Ovçu dedi: "Məsəldir: hər gecə hamilədir,
Nə doğacaq bilinmir, gör gecə hamilədir?!
Şadam ki, dünya evi darısqaldır əzəldən,
Qəm gedər, şadlıq gələr, adi haldır əzəldən.
Ağalığı-ədanı, köləliyi-təşvişi,
Yer üzünə bəxş edib bu fələyin gərdişi.
Bu ulduzlar, fələklər, bax, dövr edir həmişə,
Əzab da, rahatlıq da keçib gedir həmişə.
Şadlıq sarsa könlümü sonu qəmdir-kədərdir,
Şadlıq gəldi-gedərsə, qəm də gəldi-gedərdir.
Hər gecənin bir nurlu, günəşli gündüzü var,
Hər yoxuşun enişi, hər təpənin düzü var.
Buna qurdla Yusifin macərası deyərəm,
Qurd Yusifi yeyibsə, mən də onu yeyərəm.
Aldada bilməz məni qurduğun hiylə, kələk,
Sənin kimi şikarı tazısız qoymaz fələk".
Ovçu belə deyəndə hər yan toza büründü,
Toz tazının dalınca pərdə kimi süründü.
Ora-bura şütüdü o şikarın hərisi,
Şir dişiylə tülkünün parçalandı dərisi.
Dedi ki, pusqudayam, gərək qəsdə girəm mən,
Tülkü yaxşı bilir ki, şikar vaxtı şirəm mən.
İtməyimdən səbrinin kasası doldu sənin,
Tülkünü parçaladan inamın oldu sənin.
Mütiliyim boynuma xalta salıb əzəldən,
Vəfam ixtiyarımı alıb əldən əzəldən.
Kimin ki, ixtiyarı sədaqətə bağlıdır,
Taleyinin axırı səadətə bağlıdır.

[1] Qədim təbiblərin qənaətinə görə yağlı görək səfraya səbəb olur.

Məslək yolu ülviyyət yoludur kainatın,
Yüksəliş, təmiz niyyət yoludur kainatın...
Məslək yolu seçənlər tamaha baş əyərmi?
Dövlətin artsın deyə əlləşməyə dəyərmi?
Çarpışmağı bacarsan havadarın tapılar,
Üzünə açıq olar bütün bağlı qapılar.
Nizaminin eşq odu sanma külə dönəndi,
Qüdrətin al günəşi sönsə, o da sönəndi.

YEDDİNCİ SÖHBƏT

## İNSANIN ÜLVİYYƏTİ

Sən, ey yerdə fələyi heyrətdə qoyan insan,
Yer də, göy də nazınla daim oynayan insan[1].
Ülviyyət aləmindən xəbərdarsan deyə sən,
Qüdrətinlə şərəfsən, şansan yerə, göyə sən.
Qüdrətin pərvərişi dayən olub əzəldən,
Süd deyil, şəkər yemək qayən olub əzəldən.
Hədsiz nəcibliyinlə əşrəfisən dünyanın,
Əzəldən xeyirxahlıq bütüsən gen dünyanın
Ecazkardır qüdrətin ucu iti qələmi.
Yaradıb sənin kimi gözəl bütü qələmi.
Can damarı bağlayıb ciyərinin telinə,
Can gövhəri parlayan kəmər vurub belinə.
Aləmdir incəliyin, dünya sənin heyranın,
Çatmaz arıq ahuya əsla kökü ceyranın.
Yer üzündə vəhşilər ramdır zoruna sənin,
Quş kimi yemləyirsən, düşüb toruna sənin.
Dövlət quşu humaysan, qayən səadət olsun,
Az yemək, az danışmaq, nəciblik adət olsun.
İşığı, qaranlığı, xeyri, şəri aləmin,
Bil ki, əbəs deyildir, ey bəşəri aləmin!...
Əl vardır ki, əl qoyan yox əlinin üstünə,
Pərdə çəkər sirrinin, əməlinin üstünə.
Can atırsan açasan bu pərdənin sirrini,

[1] İnsanın şərəfli olub nazlanması onun Allah tərəfindən kamil yaradılmasıdır.



Yırtdığın pərdə açar, bil ki, sənin sirrini.
Pərdəsiz bir könülü alqışlama heç zaman,
Pərdəsiz bir havanı sən xoşlama heç zaman.
Möcüzəni göstərən bu sehirli pərdədə,
Ağlını heyran qoyur hər bir sirli pərdə də.
Bu pərdədən savayı, gəl, heç hava çalma sən,
Bu pərdədən kənarda xaric hava çalma sən.
Hər xalından, gəl, şadlan bu əsrarlı pərdənin,
Ahəngiylə qanadlan bu əsrarlı pərdənin.
Ruhunun aynasından qoy pak olsun varlığın.
Qırx günün zillətindən gülsün bəxtiyarlığın[1].
İnsan oğlu qazanar zindanda da şan-şərəf,
Gətiribdi Yusifə qaranlıq zindan şərəf.
Köləlik zəncirini zillətsiz atmaq olmaz,
İztirabsız, əzabsız şərəfə çatmaq olmaz.

## FİRİDUNLA CEYRANIN HEKAYƏTİ

İki-üç dostu ilə səhər çağı Firidun,
Seyrə çıxıb dolaşdı gen ovlağı Firidun.
Ovlağa çatan kimi ov gəzdi gözü şahın,
Vuracağı ceyrana vuruldu özü şahın.
Ürkək gözü, sağrısı qıyma deyir ovçuya,
Şuxluğu qansızlığa uyma deyir ovçuya.
Duyuq düşdü qəsdindən ona tor quran kəsin,
Nəzərindən yayındı qəsdinə duran kəsin.
İşvəsiylə, nazıyla dağ çəkdi ceyran şaha,
Dostları məftun görüb, qaldılar heyran şaha.
Köhləni şığıdıqca hirsi səmuma döndü,
Ahunun qarnı kimi kamanı muma döndü[2].
Süzən ox izinə də batammadı ceyranın,
Uçan at tozuna da çatammadı ceyranın.
Oxunu qınadı ki: can almağın nə oldu?

[1] Sən öz bədənini qırx gün riyazət ilə həva və həvəsdən uzaqlaşdırıb ləbədə saxlasan, onu dünyəvi çirkabdan təmizləyib, ruhun mərkəzi olan cəlb və can kimi pak edə bilərsən.

[2] Şah öz köhlənini özünün həvəslə odlanmış ciyəri kimi alovlandırdı və kamanın belini sürtməkdən ahunun qarnının dərisi kimi yumşaltdı. Ahunun belinin dərisi qaba, qarnınınkı isə yumşaq olur.

Atını qınadı ki: yan almağın nə oldu?
Əzəlki uçuşunuz, sürətiniz yoxdumu?
Ot yeyən bir ahuca cürətiniz yoxdumu?
Ox dedi: "Yağın deyil bu bağrı qanlı sənin,
Gözlərini oxşayır bu dilsiz canlı sənin.
Bir canın zirehi ki öz sayəndə toxuna,
Mümkünmü o zirehə hər süzən ox toxuna[1]?
Zövq əhli hər bir zaman hey zövq alsa yaxşıdır,
Təbilçinin təblini özü çalsa yaxşıdır[2].
Ülviyyət timsalıtək ucalmağa çalış sən,
Ülviyyət göylərindən öc almağa çalış sən.
Ülvi eşqə can atar əsl insan cahanda,
Bəşər ülvi eşqiylə qazanıb şan cahanda.
Uzaqgörən kəsləri zövqü səfa ucaldıb,
Eşqinə sadiqliyi, əhdə vəfa ucaldıb.
Sədaqət kəmərini öz belindən açma sən,
Əhdinə sadiqlikdən ömrün boyu qaçma sən.
İlan-qaşlı kəmərdir, gör ki, nədir qisməti,
Viranələr küncündə xəzinədir qisməti[3]...
Sığışmazsan qaranlıq, dar zindana, Nizami!
Günəş kimi işıq saç bu cahana Nizami!

## SƏKKİZİNCİ SÖHBƏT

## XİLQƏTİN GÖZƏLLİYİ VƏ KAMALIN QÜDRƏTİ

Qüdrətin nəzərində heç nəydi hələ xilqət.
Səxavət dəryasına təşnəydi hələ xilqət[4].

[1] Yəni bu ahu balası sənin nəzərinin zirehi himayəsində cövlan edir və kimin cürəti çatar ki, sənin zirehinə tərəf ox atsın.

[2] Yəni sənin baxışlarını oxşayan bu ahu gərək sağ-salamat qalsın. Heç bir mötəbər adamın xoşuna gəlməz ki, o, öldürülsün və dərisindən dəf düzəldib dümbək çalanların əli altında zərbələrə məruz qalsın.

[3] Qədimdəki təsəvvürə görə gizli xəzinələrin üstündə ilanlar yatır və onu mühafizə edirlər. Qıvrılmış ilan kəmərə bənzəyir, deməli, ilan xidmət kəməri olduğu üçün xəzinə sahibidir. Yəni hər kim bəşəriyyətə xidmət edirsə, cəmiyyətə, insanpərvərliyə qulluq edirsə, o, səadətə qovuşacaqdır.

[4] Yəni bəşər və təbiət yaranmamışdan əvvəl varlıq çox kasıb və boş idi.



Bu dünyanın əlində sərvət də, var da yoxdu,
Bu dünyanın yolunda toz da, qübar da yoxdu.
Nə vüsal vədi vardı, nə vədə gələn vardı,
Nə də sirli pərdəni sehriylə dələn vardı.
Gecə-gündüz amansız qanlı yağı deyildi,
Həyat eşqi ürəklə can qaynağı deyildi...
Bu fələk görməmişdi qərəzlə qəsdə hələ,
Torpağın qulaqları deyildi səsdə hələ.
Varlığına ümidi yoxdu hələ varlığın,
Yoxluqdan təmənnası çoxdu hələ varlığın.
Gecə-gündüz sənsizkən özünü sonsuz saydı,
Nəbatat törəməsiz, təbiətsə subaydı.
Bir tikan görməmişdi bağça-bağı dünyanın,
Göyə sovrulmamışdı toz-torpağı dünyanın...
Səyirt zülmün atını, daha meydan sənindir,
Bütün varlıq köləndir, hər cür fərman sənindir.
Beşcə gün yaşasan da ələ cam al dünyada,
Yaxşı yeyib, yaxşı yat, ancaq kam al dünyada.
Nəşələrə dalmağın sanma səfa deməkdir,
Özbaşına olmağın, bil ki, cəfa deməkdir.
Bel büküldü, qaç görüm ayağında kündə sən,
Yanarsan, qovrularsan, öz yağında gündə sən.
Mətbəx talaşasısan, bunu çətin danarsan,
Cəhənnəmin odunda ələf kimi yanarsan.
Qarnını doldurmağın hamballıq olar sənə,
Yüngüllüyün ağırlıq, sanballıq olar sənə...
Tamahın duza getsə, belə duzdan uzaqlaş,
Zirəkləri aldadan dələduzdan uzaqlaş.
Tamahı cilovlayan kamalıdır bəşərin,
Öz nəfsini öldürmək amalıdır bəşərin.
Hərisliyə uymağın qorxuludur, qorxulu!
Ondan nəşə duymağın qorxuludur, qorxulu!
Xeyirlə şər izləyir hər bəşəri əzəldən,
Xeyir xeyri tapandır, şər də şəri əzəldən.

## OĞRU VƏ TÜLKÜ HEKAYƏTİ

Yəməndə meyvəsatan kişi vardı deyirlər,
Meyvəsini bir tülkü qoruyardı deyirlər.

Ayıq-sayıq nəzərlə süzüb dörd yanı tülkü,
Qoruyardı, güdərdi hər gün dükanı tülkü.
Bir oğru hər kələyə əl atmağa başladı,
Hiyləsiylə tülkünü aldatmağa başladı.
Fürsət gəzdi, vurnuxdu, gözü dörddü oğrunun,
Yalandan gözlərini yuxu örtdü oğrunun.
Yatmış sanıb hiyləgər həris gözlü qurdu o,
Başını quyruğuna qısıb mürgü vurdu o.
Tülkünü yatmış görüb, gözünü açdı oğru,
Kisədəki pulları götürüb qaçdı oğru...
Kim ki qəflət yolunda xoş yuxuya dalandır,
Başı əldən gedəndir, papağı boş qalandır.
Ayıl, uyma qəflətdə yatmağa sən, Nizami!
Çalış qəflət daşını atmağa sən, Nizami!

### DOQQUZUNCU SÖHBƏT

## MÜDRİKLİK VƏ ALİCƏNABLIQ

Ey vüsal gecəsindən qəlbə eşqi xal salan!
Ey sülhün bayrağından tez ucalıb, alçalan!
Kölgə kimi sürünmə, qəlbinə dağ yaraşar?
Qalx ayağa, bayrağa dalğalanmaq yaraşar.
Səfər əzmi qəlbindən haçan keçər şahların,
Özü yola düşməmiş yükü köçər şahların.
Əgər şahsan, yubanma, sən başla səfərinə,
Hazırlaş cah-cəlalla, can-başla səfərinə.
Özün hələ keçməmiş büsatını yola sal,
Sabahkı azuqəni, sürsatını yola sal.
Şanı şirin balıyla niyə dolub arının?
Çünki gözü uzağı görən olub arının.
Əlləşər, çəkməz əsla ruzi qəmi qarışqa,
Sabahına bu gündən yığar yemi qarışqa.
Qafilliyə kor kimi etməsə meyil insan,
Arıdan, qarışqadan heç əskik deyil insan.
Bu dünyadan kamını almalısan, almalı,
Yayda qışın qeydinə qalmalısan, qalmalı...
Comərdliyin dünyada zəlilliyin, xarlığın,



Əzəli də, sonu da varlığındır-varlığın.
Övladının qatili bu anadan uzaqlaş,
Eşit atan deyəni, ülviyyətlə qucaqlaş[1].
Mərd atanı sal yada, əgər ki, mərd kişisən,
Çıxma onun yolundan, sən ki, comərd kişisən...
Gethagetdi gözlərik, ömrümüz kəmdir bizim,
Sikkəmizdən düzələn yeni dirhəmdir bizim.
Yoğurarlar yenidən külə dönən varlığı,
Döndərərlər əslinə gilə dönən varlığı.
Bu günündən utanıb qızarmırsan belə sən,
Xəcalətin sonradır, onu düşün hələ sən.
Möhnət yükü ağırdır, bundan halı qəlbimiz,
Bu möhnətə qatlaşar bu yaralı qəlbimiz...
Günahına peşman ol, hər cəzadan uzaq ol,
Əməlinlə, səyinlə hər qəzadan uzaq ol.

## TÖVBƏSİNİ SINDIRAN ZAHİDİN HEKAYƏTİ

İbadəti, tövbəni tamam atdı birisi,
Meyxanələr küncündə gedib yatdı birisi.
Meyə döndü göz yaşı şərab içdiyi zaman:
"Kimdən aman istəyim, deyim kimdədir aman?
Həvəs quşu qəlbimi çaldı tamah gücünə,
Təsbeh dənəm dəm oldu, — aldı tamah gücünə.
Talanmışam yolunda, mənim olub Kəbə də,
Xarabata köçəli qənim olub Kəbə də...
Həya məndən yaşınır dönüb zaya əməlim.
Xarabatı döndərib xarabaya əməlim.
Gözdən düşdüm, bu gündən dünya mənə dar olsun.
Bədnamlığım əbədi yer üzünə car olsun.
Bədbəxt olub qəzadan, səadəti boşladım,
Xarabatı xoşladım, ibadəti boşladım".
Himmətlilər lütfünü ona əyan eylədi,
Pərdədən cavabını belə bəyan eylədi:
"Bədbəxtliyin baisi sanma hədər qəzanı,
Ha qınasın sənintək min dərbədər qəzanı.

[1] Övladının qatili ana — dünya, ata — Adəmdir. Adəmin qoyduğu qanunlara, onun verdiyi nəsihətlərə qulaq asmaq lazımdır. Adəmin əsas vəsiyyəti isə günah etməməkdir.

Günahından keçənin dərgahını ara sən,
Gör dərdini deməyə sığınmısan hara sən.
Özün getsən, utanıb qızarmasan pul kimi,
Yoxsa zorla gedərsən qolu bağlı qul kimi.
Yaşıl şəkər qamışı olsun sənə fələklər,
Bu torpağın otuyla dolandın, bəsdir, yetər.
Gedənəcən yuxuya qov gözündən yuxunu,
Yoxluğa sovqat üçün hazırla var-yoxunu.
Qan çanağı görməyək birinin də gözünü,
Yuxu yumar ölütək dirinin də gözünü.
Səni dinin, məsləkin şirin yuxuda gördü.
Üz çevirib, gizlənib, niqab altına girdi".
Can həkimi atlanıb, qalx ayağa, Nizami!
Dönmə gecə yarısı bir dustağa Nizami!

### ONUNCU SÖHBƏT

## DÜNYANIN AXIRI

Ey fələk! Dolanmağın yetməzmi, yavaşı sən,
Ey yer! Qurtar bu zülmü, bu cövrü savaşı sən.
Hər gecənin gündüzə dönməyi var əzəldən,
Ucalmağın bəllidir, enməyi var əzəldən.
Zəlzələnin dəhşəti ərzə qorxu salanda,
Yerin dərin qatına lərzə, qorxu salanda.
Sərsəmlikdən torpağın coşar kini qəzəbdən,
Parçalayar fələyin zəncirini qəzəbdən...
Bir zəhərli gürzətək qıvrılandı bu fələk,
Torpaq yeyib yaşayan bir ilandır bu fələk.
Ey torpağın bağrını qan eyləyən insanlar!
Bu torpaqda varlığı gül eyləyən insanlar!
Qəm küpündə bu torpaq neçin qalan olubdur?
Bu küp matəm rəngini nədən alan olubdur?
İmkan yoxsa fənd ilə tez qırmağa bu küpü,
Gil varlığa can verib, sındırmağa bu küpü.
Çəkin, bu hisli küpdən çəkin ətəyinizi,
Yeddi dərya suyuna çəkin ətəyinizi.
Ulduzlartək qəmlənib yas paltarı geyin siz,



"Viran qalan dünyaya yas qurmuşuq" deyin siz.
Kürrəmizin başına dolansa da bu fələk,
Bircə anda verəcək onu bada bu fələk...
Fənalığın mülkünü atmalısan, atmalı,
Əbədiyyət mülkünə çatmalısan, catmalı.
Qalan deyil, dünyada gil təpəsi varlığın,
Toza dönüb aləmə kül səpəsi varlığın.
Alıb əldən hər tacı, hər nəməri bu dünya,
Açıb belə vurduğu hər kəməri bu dünya.
Hər ərənə güldürüb yağısını bu həyat,
Hər şərbətə qatıbdır ağısını bu həyat.
Günəş-soyuq fələyin qucağının odudur,
Cəhənnəmin kükrəyən ocağının odudur.
Varlığıyla göylərin çırağına dönər Ay,
Yağ almasa günəşdən, öz-özünə sönər Ay.
Xəzana da can verən bir məlhəmdir buludlar,
Sinəsindəə fələyin bir bəlğəmdir buludlar.
Hər canlıya həyatdır coşan dəmi suların,
Azmı batıb qoynunda üzən gəmi suların?
Başdan aşan eybindən həzər, həzər dünyanın,
Bəs eybinə salmırsan neçin nəzər dünyanın?
Öz eybinə göz yumub, sanma görər eybini,
Ayna kimi hər kəsin tez göstərər eybini.
Eyib açıb, açılma sən həvəsdən aynatək,
Ləkələrsən özünü bir nəfəsdən aynatək.
Qəlbin-hünər aynası bacar canı parçala,
Ya eybini göstərən o aynanı parçala.
Özgəsinin eybinə gözlərini açma sən,
Öz-özünü görəndə öz eybindən qaçma sən.
Eybi kimi hüsnü də var dünyada hər şeyin,
Hüsnünü gör, eybini salma yada hər şeyin.
Çırağını mümkünmü quca gecə gündüzün?
Qəfəsindən qarğatək uça gecə gündüzün?
Zər qanadı, görkəmi bir tamaşa tavusun,
Ayağının eybini qaxma başa tavusun.
Qapqaradır görkəmi, özünə bax qarğanın,
Ağappaqdır gözləri, gözünə bax qarğanın.

## İSANIN HEKAYƏTİ

İz qoyaraq dünyanın torpağında, daşında,
İsa ayaq saxladı bir bazarın başında.
Qurda bənzər köpəyi düşən gördü yol üstə,
Can Yusifi çıxmışdı dar quyudan dol üstə.
Baxdıqca iyrənirlər hopub qoxu leşinə,
Leş hərisi quzğuntək baxır çoxu leşinə.
Biri deyir: "İy basır künc-bucağı bir anda,
Üfunəti qaraldar gür çırağı bir anda".
Biri deyir: "Törətməz nələr, nələr bu qoxu,
Görən gözü kor qoyar, qəlbi dələr bu qoxu".
Calayaraq sözbazlar biri beşin üstünə,
Qarğış, lənət yağdırdı murdar leşin üstünə.
Baxıb hikmət gözüylə vaz keçərək eyibdən,
İsa necə söz açdı indi görək eyibdən:
"Bu fələyin hökmündə hansı varlıq zay deyil?
Parlaq inci bu itin ağ dişinə tay deyil".
Bu sözlərə üzləri oldu hədəf onların,
Dişlərini ağartdı yanmış sədəf onların.
Yad eybinə dikmə sən hər baxanda gözünü,
Gör açanda, yumanda öz yaxanda gözünü.
Ələ güzgü almazsan bəyənməsən özünü,
Öz-özünə vurulub bəyənmə sən özünü.
Neyləyirsən ziynəti, təravəti bahar tək,
Soldurmasın ruzgarın hər afəti bahar tək.
İncə sapla tikilib ar libasın əzəldən,
Bürün doqquz pərdəyə, var libasın əzəldən[1]...
Fələk kaftar qarıdır, vəfasına gəl uyma,
Dünya bağdır — xəzanlı, səfasına gəl uyma.
Hər cəfası bəllidir çox əzəldən dünyanın,
Bir arpacan dəyəri yox əzəldən dünyanın.
Çəkmə dünya qəmini, oyan, ağa, qəflətədən,
Səslər səni Nizami oyanmağa qəflətdən.

[1] Dini əsatirə görə Allah doqquz fələyi insaların günahlarının üstünü örtmək üçün pərdə yaradıb ki, mələklər günahları görməyib yalnız savab işləri müşahidə etsinlər.





## MÜDRİK MÖBİDİN HEKAYƏTİ

Atəşpərəst bir möbid Hindistanı dolaşdı,
Bahar çağı ətirli gülüstanı dolaşdı.
Hərtərəfi naxışlı kaşanəydi gördüyü,
Cah-cəlallı diyardı gör ki, nəydi gördüyü
Qönçə zalım fələktək hey qan içir doymayır,
Ömrü necə gödəkdir yazıq lalə duymayır.
Göy çəmənin çırağı, məşəlidir gül-çiçək,
Qəndab qatıb meyinə-nəşəlidir gül-çiçək.
Yaralayıb öz oxu-can üstədir gül indi,
Söyüd qorxub canından, tökür başa kül indi.
Öz saçından bənövşə kəsmik salıb boynuna,
Xumar gözü nərgizin dirhəm səpir qoynuna.
Gül-firuzə lələsə gövhər ovur çəməndə,
Solacaq, gülsələr də bircə hovur çəməndə.
Həyatları həyatda bircə ana bağlıdır,
Düşünən yox son günü, bu cahana bağlıdır.
Qoca möbid tərk etdi cənnət təki bu bağı,
Sonra da seyrə gəldi cənnətdəki bu bağı:
Köçüb bülbül, solub gül, gülşən varmı dolaşa?
Haray-həşir salıbdır qarğa-quzğun, dolaşa.
Behişt olub cəhənnəm, büsat zaya gedibdir,
Haman qəsrin qeysəri kəlisaya gedibdir.
Otlar necə yanıbsa-kül topası yerində,
Topa-topa tikanlar — gül topası yerində.
Vaxtsız solan güllərdən qəlbi qubar bağladı,
Puç varlığa gülərək öz halına ağladı:
Hansı varlıq əbədi qalan olub həyatda?
Hər varlığın həyatı talan olub həyatda.
Nə ki, sudan, torpaqdan baş qaldıran olubdur,
Öz başına axırda daş saldıran olubdur.
Xarabatın yolunda varmı məyər yaxşı yol?
Xarabata üz qoysam, hamı deyər: "Yaxşı yol".
Müdrikliyin qüdrəti görk elədi özünü,
Yaradanı tanıdı, dərk elədi özünü.
Vaqif oldu sirlərə, şübhələri sovuşdu,

Ülvi eşqin yolunda öz əslinə qovuşdu.
Ey müsəlman, öyünmə, atəşpərəst deyilsən,
Bir günəşin eşqindən zərrəcə məst deyilsən.
Kaş ki, hindli möbid tək dərk edəsən dünyanı,
Bu dünyaya uymadan tərk edəsən dünyanı.
Nə vaxtadək gül kimi başda yaşar qürurun?
Beldə kəmər, başda tac, başdan aşar qürurun.
Öz əlinlə belindən aç kəməri gül kimi,
Dünya bələr qanına tac, kəməri gül kimi.
Tacla kəmər canını salar lova cahanda,
Xarabatın eşqinə ver girova cahan da.
Tacın varsa gül kimi, həlalikdir, həlalik!
Belə kəmər vurmağın köləlikdir, köləlik!
Ağalıqdan, qulluqdan çalış azad yaşa sən,
Nizami tək ülviyyət mülkündə şad yaşa sən.

## ON İKİNCİ SÖHBƏT

## DÜNYA İLƏ VİDALAŞMAQ

Qalx ayağa, cahanla vidalaşıb köç daha,
Fitnə-fəsad yurdunda qala bilməz köç daha.
Köçməlisən yurdundan daha gözəl yurda sən,
At hücrəni bir qapı aç üzünə burda sən...
Döndər qara torpaqda şəffaf suya qəlbini,
Bağla ülvi qayəyə, saf arzuya qəlbini.
Fənalığa uğrayıb talanınca varlığın,
Ayrılığın oduna qalanınca varlığın.
Qədəmini sidq ilə atmalısan mənzilə
Atıb ağır yükünü çatmalısan mənzilə.
Dünya evi hədərdir, könül də bir məskənin,
Ucal uca göylərə, könüldədir məskənin.
Yuva sanma özünə can sıxan dar qəfəsi,
Ülvi eşqin yolunda parçala, yar qəfəsi...
Əməlinin qəlbini sıxmağını bir düşün,
Girməmişdən bir yerə çıxmağını bir düşün.
Atma xətər qoynuna görən gözlə özünü,
Yolundakı quyudan gözlə, gözlə özünü.



Seldə qalan bu qəsri çalış yara biləsən,
Fəlakətin əlindən can qurtara biləsən.
Zirək tülkü itlərdən daim qorxub qaçsa da,
Yuvasından çıxmağa iki deşik açsa da,
Qurtarmayıb ölümdən kələk onu yuvada.
Tüstüsüylə boğubdur fələk onu yuvada.
Uydun keyfə, şadlığa qəflətdə sən əzəldən,
Varlığını unutdun, qəflətdəsən əzəldən...
Düşünmə ki, mümkünmü sındıra can şüşəni,
Bircə odlu ahınla sındırarsan şüşəni.
Comərd insan canında zər odunu söndürüb,
Şirin dillə düşmənin hər odunu söndürüb.
Öyün bilik çeşməsi nur saçan könüllə sən,
Günəş kimi, düşməni öldür nurla, güllə sən.

## İKİ RƏQİB ALİMİN HEKAYƏTİ

İki alim yaşardı hikmət evi dünyada,
Höccət başdan aşardı hikmət evi dünyada.
Hər biri "mən", "mən" dedi, "sən", "sən" deyən olmadı,
Bu mənzilin sahibi "sənsən" deyən olmadı.
İki deyil yaradan, tanrı təkdir dünyada,
Bir baş varkən ikinci nə gərəkdir dünyada?
İki cəmşid bir yerdə dövran sürə bilərmi?
İki qılınc bir qına, söylə, girə bilərmi?
Bir-birinə qənim tək kələk qurdu alimlər,
"Hikmət evi mənimdi" deyib durdu alimlər.
Hikmət evi çevrildi kin-ədavət evinə,
Biri köçsün, ev dönsün bir ədalət evinə.
Canla, başla girişdi iki yağı köçməyə,
Hazırlaşdı hər biri toran çağı köçməyə.
Dedilər ki, bu evdən köçsək daha yaxşıdır,
İki şərbət düzəldib içsək daha yaxşıdır.
Bir görək ki, kim-kimə yağıdan da betərdir,
Görək kimin şərbəti ağıdan da betərdir.
İki hikmət mülkündə qala bilək hünərlə,
Bir bədənə iki can ala bilək hünərlə.
Biri zəhər düzəltdi beyni-başı yandıran,
Üfunəti, qoxusu qara daşı yandıran.

Verib dedi: "Nuş eylə, nəşə verən meydi bu,
Zəhər deyil, şərbətdən daha şirin meydi bu".
Şir ürəkli bildi ki, qatıb meyə ağını,
Alıb çəkdi başına şərbət deyə ağını.
Çimmək üçün qaynatdı nuşgiyanı əlüstü,
Tiryək kəsdi zəhəri, hər ziyanı əlüstü.
Pərvanətək yansa da yenə qanad açdı o,
Hər məclisə şam kimi öz nurunu saçdı o.
Gül bağından gül dərdi, yaman güldü düşmənə,
Zəhər deyil, qıydığı haman güldü düşmənə.
Qəniminə uzatdı qoxuduğu o gülü,
Püfləyərək bir əfsun oxuduğu o gülü.
Nifrətiylə yağıya o, yağıdan betərdi,
Gülündəki hər tikan o ağıdan betərdi.
Əfsunlu gül ruhunu sıxdı, sıxdı yağının,
Vahimədən, qorxudan canı çıxdı yağının.
Dərdə əlac tapan kəs gülən oldu həyatda,
Bircə güldən qorxan kəs ölən oldu həyatda...
Məsləkinlə qolunda qüvvət duysan əyər sən,
Ədalət mizanını sanma tükcə əyərsən.
Heç bir hünər sahibi-comərd insan dünyada,
Məsləkini dünyaya satmaz, inan, dünyada.
Sənin kimi dünyaya salmaz meyil Nizami,
Sən uysan da dünyaya, uyan deyil Nizami.

### ON ÜÇÜNCÜ SÖHBƏT

## DÜNYANIN MƏŞƏQQƏTİ

Özü qoca, qəlbi dar dünyaya bax gəl indi,
Boyasına aldanıb sanma təzə gəlindi.
Qocalıqla cavantək görünən bu insanın,
Çələng deyil əlində, od-atəşdir, inanın!
Çeşməsinə aldanma, ilğım çaylar qoynunda,
Səcdəsinə əyilmə, xaçdı yanan boynunda.
Qəlbə tikan sancmamış gülmü taxar yaxana?
Gül qucunca, gül kimi qanın axar yaxana.
Yığdın dünya malını, bəli, dolu gedəsən,



Əlidolu gəlmişdin, əlidolu gedəsən?!
Varla köçən sanma ki, şər xətadan qurtarıb,
Pul-parasız köçənlər hər xətadan qurtarıb.
Qazansan da, udsan da, çıxacaq var əlindən,
Nə veriblər axırda, alacaqlar əlindən.
Qiyamətə qoyarmı qalsın qisas bu dünya?
İstəyir ki, hamıdan alsın qisas bu dünya.
Baramanı qurduna toxutdurur həmişə,
Qarışqayla o qurda qan uddurar həmişə.
Cəfər kimi şam olsun sarı gülün qəlbinə,
Çıraq kimi nur saçsın barı gülün qəlbinə[1].
Yanma doqquz qapılı fələktək mis, qızılla,
Altı başlı büt kimi təmiz, xalis qızılla.
Kəreminlə tapdayıb əz qızılı gül kimi,
Zər eşqindən açılıb gülmə qızıl gül kimi.
Bir qızıl ki, olmasın yaxşı adın üstündə,
Mərgümüşlə kükürddür yanan odun üstündə.
Zər aşiqin kim görüb ər kimidir həyatda?
Tavusun da quyruğu zər kimidir həyatda.
Od içindən dəmirlə zər götürən şah olar?
Dəmirçidir, şah deyil, nəsibi də ah olar.
Çox güvənəən gördülər qızıl taca Qarunu,
Öz günahı batırdı torpağaca Qarunu[2].
Tac sevdası — baş yükün, iztirabın, qəhərin,
Qızıl taxtın — atındır, qızıl tacın yəhərin.
"Canım çıxsın, çıxmasın əldən qızıl" deyirsən,
"Yığım, yığım öluncə eldən qızıl" deyirsən.
Hərislikla canını yaxar odu cahanın,
Səxavətlə canından çıxar odu cahanın.
Qızıl üstə qəlbini qanatmasan yaxşıdır,
Əzəl gündən qızıla can atmasan yaxşıdır.

---

[1] Beytin mənası: Bu sarı gülə bənzər cəfəri qızılını payla, bağışla və xeyirxahlıqla onu özünə şam eylə ki, çıraq kimi axirətdə yağa çatarsan.

[2] Qızılı onun gözəlliyinə görə sevirsənsə, tavusun quyruğu ondan da gözəldir. Niyə qızıl əvəzinə onu yığmırsan? Padşahlar adi dəmirçilərdən çox aşağı səviyyədə dururlar. Çünki onlar qızılı zülm və sitəm edərək öz dəmir qılınclarıyla yığır, sonra da onun üstünə öz adlarını həkk edirlər. Zülmkar şah və hökmdarlar gərək yaddan çıxarmasınlar ki, qızıldan özünə papaq, tac düzəldən xəsis Qarun həmin qızıl yolunda da yerin quyusuna düşüb həlak oldu.

## HACI VƏ SUFİ HEKAYƏTİ

Kəbə eşqi qəlbində aşıb-daşan hacının,
Zəvvar kimi hamıyla halallaşan hacının,
Tanıyanlar, bilənlər xəbərdardı halından
Bircə kisə qızılı vardı dünya malından.
Düşündü ki: bir sufi gözütoxdur əzəldən,
Onun dünya varında gözü yoxdur əzəldən.
İnanıram bir ona, dəyanəti var onun,
Əmanətə kim deyər xəyanəti var onun.
Durub getdi evinə, açdı dərdi sufiyə,
Qızıl dolu kisəni saxlanc verdi sufiyə.
Dedi: "Saxla, çıxmasa bu can, gəlib çıxaram,
Qaytararsan yenə də haçan gəlib çıxaram".
Hacı yola düzəldi, nəsibi qan-tər oldu,
Zər aşiqi bu şeyxə girov qalan zər oldu:
Yarəb, mən nə uzağa, nə yaxına sığındım,
Yoxsulluqda həmişə dərgahına sığındım.
Kəraminlə ucaltdın gör ki, məni hara sən,
Bir yoxsulu yetirdin istədiyi vara sən.
Tez xərcləyim yeyim ki, yüzü alar əlimdən,
Tanrı özü versə də özü alar əlimdən.
Açan kimi kisəni, aman, necə şelləndi,
Kef-damağı çağ oldu, neçə gecə şelləndi.
Haman müftə qızılla tezcə harın oldu şeyx,
Gödənini doldurub xaşalqarın oldu şeyx.
"Əritdiyi" qızıllar qursağını yağladı,
İpək telli sənəmlər qurşağını bağladı.
Axır cini hürkütdü əbasının yırtığı,
Dönüb oldu elində sırtıqların sırtığı.
"Şikarını" hülüdüb ac-yalavac qaldı o,
Çırağına tökməyə yağa möhtac qaldı o.
Gəlib çıxdı axır ki, ziyarətdən bu hacı,
Xəbərsizdi qızıldan, o qarətdən bu hacı.
"Əmanəti özümə qaytar" deyib-dindi o,
Şeyx dedi ki, batıbdır, yoxsa çıxıb indi o?
İnad etmə, dilimə haçan yalan gəlibdir?
Haçan viran bir kəndə xərac alan gəlibdir?
Mənimtək arif hara, sən atdığın şər hara?



Hava gəlib başına? Müflis hara, zər hara?...
Comərdliyi hökm etdi: yandırmasın zər səni,
Qoy yumşaltsın o şeyxin üzündəki tər səni.
Tanrı özü vermişdi, özü aldı qızılı,
Səxavəti, mərdliyi gözdən saldı qızılı.
Öz-özünü danladı: nəyi var ki, alım mən?
Bir çöpü də yox onun, nəyə çatır gümanı?
Girovunu verməyə imanadır gümanı.
Əmanətdən qalıb ki, o, qıya qaytarmağa.
Nəmənəsi qalıbdır hacıya qaytarmağa.
Dedi: -Qəddin sınmasın günah yükündən sənin,
Haram pullar halalın olsun bu gündən sənin.
Fələk kimi dolanıb özün qazan neməti
Əldən qapıb ətəyə yığma asan neməti...
Arzu, istək tərəzin qızıl çəkən olmasın,
Müqəddəssən, qəlbində çalış ləkən olmasın.
İstəyinin yolunda saf çeşmətək çağla sən,
Nizamitək könlünü ülviyyətə bağla sən.

ON DÖRDÜNCÜ SÖHBƏT

## HAQSIZLIQ VƏ DOĞRULUQ

Ey öküzə, ulağa harınlıqda tay olan!
Ömür, günü qəflətdə gecə-gündüz zay olan!
Batıb-çıxan Günəşin gərdişindən xəbərsiz!
Bu laciverd göylərin hər işindən xəbərsiz!
Müdriklər əməliylə şöhrətidir aləmin,
Nadanlar qəflətiylə möhnətidir aləmin
Hünər, qeyrət dəmidir, yatma əbəs həyatda.
Ülviyyətə çatmağa göstər həvəs həyatda.
Niyə kefli yatırsan? Qəsdindədir bu fələk,
Aqillərtək ayıq ol, bil ki, nədir bu fələk.
Yatanlara yaxşı bax, bu qəfləti tərk elə,
Gör ki, hara gedirsən, axırını dərk elə.
Ağlın huşsuz qocadır, anmaz səni heç zaman,

Kimliyini bildirsən danmaz səni heç zaman[1].
Kamalına görədir şan-şöhrətin dünyada,
Onsuz adın, hünərin olar çətin dünyada.
Öz ağlundır İsatək möcüzəni yaradan,
Ulaq görmək istəməz, bil ki, səni yaradan.
Ya ağlınla ucalıb al Günəşə qovuş sən,
Ya da uca dərgahın qapısından sovuş sən.
Yol göstərən ağılı məst eləmək yaramaz,
Sərçə üçün tərlana qəsd eləmək yaramaz.
Halaldır demişdilər hər məqamda bu meyə,
Sonra haram etdilər ağla düşməndir deyə.
Çox da dünya qəmini pərən salan şərabdır,
Ağa, içmə ağlım əldən alan şərabdır.
Çaxır duztək ciyərdə yanan odu söndürər,
Əyyaşların bağrında, inan, odu söndürər.
İçmə, huşyar eyləməz o içdiyin mey səni,
Yaddan çıxar varlığın, şərab eylər key səni.
Sərxoşluğa uyan kəs ələm çəkər ömürlük,
Aqilliyin üstünə qələm çəkər ömürlük.
Xülyaların gözləri qoy milinlə kor olsun,
Meyxanənin meyiylə qoyma ciyər qor olsun.
"Əlif" kimi öyünmə düzdür deyə qamətin,
Lovğalıqdan əyilər bu fələyə qamətin.
"Əlif" olsan, qanadsız quşa dönüb uçmazsan,
"Bey" kimi əyilməsən, bu torpağı qucmazsan.
"Əlif" qəddin olsa da hər məclisə yaraşıq,
Yaraşarmı "Əlif" tək sən müflisə yaraşıq?
Sən ki, tikan deyilsən, dikbaş görə el səni,
Gülə bənzə, oxşasın həzin əsən yel səni[2]...
Hər eybini əyrilik açan olub həyatda.
Doğruluqla qəm-qüssən haçan olub həyatda?
Tərəzitək doğruluq pozar çətin mizanı,
Ürəyinin düzlüyü-ədalətin mizanı.
Bircə arpa, bircə dən güdən olsa qərəzin,

[1] Ağlın qocalıb hafizəsini itirdiyi üçün səni yada salıb yol göstərməyəcək. Odur ki, sən onu yada sal və ondan kömək istə.
[2] Tikan həmişə şax, dik durur, əlindən pislikdən başqa bir şey gəlmir. Gül isə dairəvi olduğu üçün heç bilinmir başı haradadır, ayağı harda, gül təvazökar olduğu üçün insanlara öz ətri və gözəlliyi ilə hədsiz sövq verir.



Əskik ölçsə çanağın, əskik çəkər tərəzin,
Bil ki, onlar baisdir günahına son gündə,
Canlı şahid olacaq tamahına son gündə.
Faydasızdır sarsılıb, yuxalmağın o zaman,
Dürar gözə az verib, çox almağın o zaman.
Tərəzinin milini etmə xəncər qəlbinə,
Çox verərək az almaq qüvvətdir ər qəlbinə[1]
Əyri gülü düzlüklə tikan qucar, aldadar,
Bil ki, şəkər qamışı düzlüyündən bal dadar.
Doğruluğun harda ki, ucalıbdır bayrağı,
Haqq əliylə fələkdən öc alıbdır bayrağı.

## ZALIM ŞAHLA DÜZ DANIŞAN QOCANIN HEKAYƏTİ

Xalqa yağı şah vardı, zülmkarın biriydi,
Həccacdan da betərdi, lap qəddarın biriydi.
Hər gecə-min qəzanın fərmanıydı ölkədə,
Hər səhər-min cəzanın fərmanıydı ölkədə.
Şah yanına bir çuğul səhər tezdən qaçardı,
Ay, gün açmayan sirri o əlüstü açardı[2].
Gecə yatmayıb, Aydan dolanmağı öyrənər.
Səhərdən hər ürəyə boylanmağı öyrənər.
Şaha xəbər verərdi: biri sənə yağıdır,
Deyir: "Zalım şahımız nahaq qanlar axıdır".
Çuğulçunun sözündən qəzəblənib şah dindi:
"Düşmənimin cəzası yalnız ölümdür indi".
Qum tökdürdü gön üstə, cəllad hazır dayandı,
Divanənin cəzası divlərə də əyandı.
Yel tək cumdu bir cavan mərd qocanın yanına
Dedi: "Şahın hökmüylə batmalısan qanına.
Çağırmamış divsifət, dur, özün get saraya,
Tez başına çarə qıl, çatan olmaz haraya".
Yuyunaraq boynuna kəfən saldı o qoca,
Getdi şahın yanına, əhli haldı o qoca.

[1] Yəni sən tərəziçi və qapançı olma, əgər olsan, onda çox ver, az al.
[2] Ay və günəş sirləri açandır. Çünki gizli işlərin hamısı gecənin qaranlığında gəlir. Ay çıxanda, sübh açılanda isə hər şey görünür, gizli işlər faş olur.

Şah görəndə kəfəni, bildi nədi bu halət,
Qəzəbindən utanıb özü çəkdi xəcalət.
Dedi: "Qoca, qaramca sən o ki var demisən,
Mənə zalım demisən, mənə qəddar demisən.
Süleymanın cəlalı görürsən ki mənimdir,
Söylə, niyə deyibsən, şah ölkəyə qənimdir?"
Qoca dedi: Adına mən yoxsa şər demişəm?
Dediklərin nədir ki, ondan betər demişəm.
Qoca, cavan əlindən içib ölüm zəhəri,
Biyarın cana yığıb saysız kəndi, şəhəri.
Mən deyirəm eybini, şər işini özünə,
Göstərirəm güzgü tək hər işini özünə.
Hər eybini göstərər, alsan ələ güzgünü,
Utan, qızar eybindən, qırma elə güzgünü.
Düzlüyümlə sadiq bir hökmdara sən məni,
Əgər doğru demirəm, çəkdir dara sən məni".
Şaha sübut eylədi düzlüyünü o qoca,
Açdı şahın qəlbindən həpdüyünü o qoca.
Şah gördü ki, düz deyir, bildi nədir haqsızlıq.
Qoca tamam haqlıdır, özündədir haqsızlıq.
Dedi: "Alın kəfəni, bu kafuru qocadan,
Xələt verin, müşk səpin, razıyam bu qocadan".
Zülm etmədi, el bundan agah oldu o gündən.
Xalqı sevən, insaflı bir şah oldu o gündən...
Doğru sözə bağlıdır öz qüdrəti həmişə,
Qoy qüdrətdən güc alsın söz qüdrətin həmişə
El gözündə Nizami ucalıbdır düzlükdən,
İlhamına, qəlbinə güc alıbdır düzlükdən.

ON BEŞİNCİ SÖHBƏT

## ŞAHZADƏ HEKAYƏTİ

Deyirlər ki, hakimdi uzaq Mərvə bir cavan,
Boy-buxunda bənzərdi uca sərvə bir cavan.
Dövlət adamlarından inciyirdi, bezirdi,
Onlar onun əksinə külək kimi əsirdi.
Köhnə şahlar bəslədi təzə şaha ədavət,



Lərzə saldı canına həm dərgaha ədavət.
Bu qovğadan beynini təlaş yedi bir gecə;
Bir ixtiyar yuxuda ona dedi bir gecə:
"Ey təzə Ay, nurunla köhnə bürcü boğ daha,
Ey təzə gül, köhnə şax qoyma versin zoğ daha.
Belə etsən şahlıqdan başın daim sağ olar,
Qaş-qabağın açılar, kef-damağın çağ olar".
Qalxan kimi yuxudan öz işini bildi şah,
Kim ki, ona qənimdi, yer üzündən sildi şah.
Yıxıb köhnə sarayı, yeni saray qurdu o,
Şahlığıyla bəzədi səltənəti, yurdu o.
Məmləkəti dağıdan başsız qalsa yaxşıdır,
Xain ordu basılıb tar-mar olsa yaxşıdır.
Buda köhnə budağı, yeni pöhrə görərsən,
Təzə cavan budaqdan, təzə bəhrə görərsən...
Ağıl-kamal mücrüsü ülviyyətə bağlıdır,
Kin xəncəri sanma ki, pak nityyətə bağlıdır.
Kamalındır dövlətin, kamalına arxalan
Amalındır comərdlik, amalına arxalan...
Qurtuluşun tarlası kərəm dəni bəsləyər,
Vaxt gələr ki, nemətlə kərəm səni bəsləyər...

ON ALTINCI SÖHBƏT

## ZİRƏKLİK

Bir nəsimin gücüylə ərzi bəzər bayrağın,
Basılanda özün tək yerdə gəzər bayrağın.
Kəndin var ki, "Kəndxuda mənəm kəndə" deyirsən?
Mülkün var ki, "Süleyman taxtı məndə" deyirsən?
Sən ki, qılınc deyilsən, qırhaqırın bəs nədir?
Sən ki, təbil deyilsən, gurhagurun bəs nədir?...
Bizdən əzəl dünyaya gəlib-gedib çoxları,
Çatmaq üçün mənsəbə nələr edib çoxları.
Söylə, hanı, qalırmı bu dünyada şöhrəti?
Ucalsa da alçalıb, gedib bada şöhrəti.
Bir zərrəsən, göylərə ucalası olsan da,
Göydən günəş, ay kimi öc alası olsan da,

Sanma enən deyilsən, bir hakimsən göyə sən.
Enməlisən torpağa, Yer oğlusan deyəsən.
Öz başını əlinlə, saçın kimi kəsmisən,
Məhəccərli dərgahın qapısını kəsmə sən.
Quş deyilsən, qanadsız, bil, uçmağın çətindir,
Can vermə cən vüsala, qovuşmağın çətindir.
Heyran qalsın hünərin, öz ərinə bu fələk,
Təslim olsun gücünə, hünərinə bu fələk.
Zəhərləyib mey səni, ağı səni neyləyib?
Günahkarsan, günahsız yağı sənə neyləyib?
Comərdsənsə, deməzsən "Çox xəbisdir bu dünya"
Biz özümüz pisiksə, sanma pisdir bu dünya.
Heyrətdəyik aramsız gərdişinə aləmin,
İnsan istər yarasın hər işinə aləmin...
Bəxtiyarlıq mülkünü məslək əri alıbdır,
Zirəkliyi, mərdliyi, alın təri alıbdır.
Xoşbəxtlərin başına canla-başla dolan sən,
Dolanmadan dünyanı, naz-nemətlə dolan sən.
Bədbaxtlarla xoş keçməz xoşbaxtların xoş vaxtı,
Ad qazanıb, ol eldə xoşbaxtların xoşbaxtı.
Bağlayaraq fələyin cövzasına vaxtını,
Qoz sındırıb, cevizdə, qozda sına baxtını[1].
Həlimliklə üzünə qapı açar taleyin,
Yeddi göyün qəsrinə olar açar taleyin.
Su saflığıyla canda odu külə döndərər,
Öz düyünü atəşdə, udu külə döndərər[2]...
İnsan adı daşıyan hanı, varmı dünyada?
Bircə könül həmdəmi, tapılarmı dünyada?
Doqquz katib yazıbdır iki hünər dastanı[3],
Şərlə başlar, şərlə də qurtarar hər dastanı.
Bu fələyin oxundan, söylə, sapmaq olarmı?
Əjdahanın ağzından həyat tapmaq olarmı?
Fələk açsa başına nə pəstaha yaxşıdır,
Nadan dostdan ağıllı düşmən daha yaxşıdır.

[1] Xoşbəxt və bəxtəvər adamlarla dur-otur ki, xoşbəxt olasan.
[2] Udu məcmərdə yandırdıqda ətir saçarmış.
[3] Doqquz katib-doqquz qat göylər. İki hünər kitabı-gecə və gündüz.



## AĞILLI UŞAĞIN HEKAYƏTİ

Qayğı bilməz bir uşaq, bir gün başda tay-tuşu,
Çıxdı evdən yanında özü yaşda tay-tuşu.
Düşər-düşməz getdiyi yola izi oğlanın,
Qaçan zaman burxuldu birdən dizi oğlanın.
Ayağından bir yolluq əli sanki üzüldü,
Ödü — bağrı yarıldı, beli sanki üzüldü.
Tay-tuşları bu haldan gör nə hala düşdülər,
Müsibətə, bəlayə, qalmaqala düşdülər.
Yaxın dostu dedi ki: "Necə ataq biz onu?
Ataq dərin quyuya səssiz-səmirsiz onu.
Özümüzü gündüztək oda yaxa bilərik,
Atasının üzünə necə baxa bilərik?".
Ağıllıydı, hər şeyi düşünəndi birisi,
Baxmayaraq onunla bir düşməndi birisi.
Düşündü ki: "qalsa da, indi naçar uşaqlar,
Vaxt gələr ki, bu sirri bir gün açar uşaqlar.
Qənimiyəm, bilirlər, məni qana salarlar,
Günah qalar üstümdə, şər-böhtana salarlar".
Xəbər verdi əlüstü atasına uşağın,
Əncam çəkdi atası xatasına uşağın.
Öz ağlının gözüylə baxan kimdir aləmə,
Ən qüdrətli, yenilməz bir hakimdir aləmə.
Kim olubdur sirrinə bir aşina fələyin,
Ayağını qoyubdur düz başına fələyin.
Bilir göyün sirrini azdan, çoxdan Nizami,
Ərş evinə yüksəlib odur çoxdan Nizami.

### ON YEDDİNCİ SÖHBƏT

## HEYSİYYƏTİ QORUMAQ

Ey tanrıdan, özündən daim qafil olan kəs,
Can qeydinə qalmaqdan saralaraq solan kəs.
"Mən", "mən" deyib öyünmə, axır can da çıxandır,
Can boğaza gələndə bircə anda çıxandır.
Göylər kimi dünyanı bürüməyə can atma,

Nə ki sənin deyildir, sürüməyə can atma.
Dünya yıxıb gücüylə hər ərini dünyanın.
Tutmaz tamah tərəzin gövhərini dünyanın...
Məmnunluğun kəməri belə möhkəm bağlıdır,
Kimsə onu açammaz-elə möhkəm bağlıdır.
Hərislərdir, sələmçi, var möhtacı dünyada,
Məmnunluqdur hər başın şərəf tacı dünyada.
Quldurdandır varlının can qorxusu bu yolda.
Kim kasıbdır quldurdan yox qorxusu bu yolda.
Varın varsa, ovutmaz arzu-kamın dərdini,
Varın yoxsa, ovudar yoxsul damın dərdini...
Sənə qalan deyildir dünya evin dünyada,
Ulaqsızsan, yüksüzsən, buna sevin dünyada.
Daim könül mülkünə sən də can at İsa tək,
Ulaqsızca, yüksüzcə mənzilə çat İsa tək...
Çox yeməyə, toxluğa çalışmağın yaxşıdır?
Az yeməyə, pəhrizə alışmağın yaxşıdır?
Aslan azca yeyir ki, şikar alan olubdur,
Atəş doymaq bilmir ki, tez qaralan olubdur[1].
Gündüz bircə kökəylə süfrə açıb həmişə,
Müdriklərin gözünü işıq saçıb həmişə.
Sübhün odlu meyindən bağrı yandı gecənin[2],
Əndamını qaraldan haram qandı gecənin.
Çox yeməkdən kütləşər, ağlın kəm olar sənin,
Reyhan kimi qəlbinə qüssə, qəm dolar sənin.
Ağıl-sənin ruhundur, onsuz quru bədənsən,
Ruh-xəzinə, can-tilsim, xəbərsizsən nədən sən?
Varlığında bilməsən yoxmu, varmı xəzinə,
Sındırmasan tilsimi, nur saçarmı xəzinə?
Bel bağlama heç zaman vəfasına varlığın,
İnan ancaq cövrünə, cəfasına varlığın...
Hər insanın şadlığı, qəhəri var dünyada,
Sevincin də, qəmin də təhəri var dünyada.
Şənləndikcə ələmli olmağını unutma,
Gah nəşəli, gah qəmli olmağını unutma.

---

[1] Şir uzun müddət ac qala bildiyi üçün məğrur və başı ucadır. Alov i hər şeyi "yeməyə" — yandırmağa qadir olduğu üçün "acgöz və qarınqul dur".

[2] Sübhün odlu meyi — şəfəq.



Hər şad qəlbin qəm odu, nalə, fəryad səsi var,
Hər gündüzün gövhəri, gecənin şəvəsi var[1].
Hərislikdən kimin ki, bağrı yanan deyildir,
Tamahkarlıq yolunda qamçılanan deyildir.
Hansı karvan zınqırov səslənmədən gedibdir?
Hansı milçək şəkərlə bəslənmədən gedibdir?
Təlim verən çoxbilmiş bir dayədir zəmanə,
Nələr öyrətməyibdir gör ki, nədir zəmanə.
Dayən sirkə içirsə, coşma ki: -Xeyri nədir?
Dinmə, bəlkə də elə bu sənin xeyrinədir.
Əbədiyyət yoluna kim yolçusa cahanda,
Odur Xızrın yoldaşı, odur Musa Cahanda[2].
Uluların yolunun gərək qulu olasan,
Ülviyyətə yüksəlib, sən də ulu olasan.
Elə sadiq dost ara, səni darda qoymasın,
Çəkib tordan çıxarsın, səni torda qoymasın.

## ON SƏKKİZİNCİ SÖHBƏT

## İKİÜZLÜLƏRİ MƏZƏMMƏT

Saxta qızıl kəsməyə qurşanıbdır çoxları,
Qəlp pulunu qəlbinə nur sanıbdır çoxları.
Üzü qızıl, içi mis saxta pul san onları,
Hər sözünə qulp qoyar, tanı hər an onları.
Üzlərinə baxanda aydan arı hər biri,
Əməliylə aləmin riyakarı hər biri[3].
Üzdə şamdır, daxildə düyünlü ud hamısı,

---

[1] Sevinclə kədərin bir yerdə olması mümkün olan şeydir. Sevinclə çırpınan bir ürəkdə adətən ürəyi sızladan bir qüvvə və qəm, ah və nalə də gizlənmiş olur. Hüzn və matəmlə dolu olan qəlbdə sevinc və fərəh üçün işıq yolu da vardır. Şəvə, əqiq və qaranlıq gecənin qoynunda gündüzün gövhəri olan günəş gizlənmişdir.

[2] Qəza və qədərin fəlakətli yoluna yalnız möhkəm iradəli, sabitqədəm adamlar dözə bilərlər. Çətin, təhlükəli yollarda fəlakətə düçar olmuş insanları xilas etmək üçün Xızır kimi çalışqan bir adama Musa peyğəmbər kimi mətin və möhkəm bir insan yoldaşlıq edə bilər.

[3] Haman saxta, ikiüzlü adamlar sənin qabağında işıq kimi üzünə güləcək, səninlə həmrəy olduğunu bildirəcək, dalda isə kölgəni qılınclayıb, sənə qarşı riyakar, dağal, ikiüzlü olub, kölgə kimi səndən üz çevirəcəklər.

Üzdə sadə, daxildə xəbis vücud hamısı[1].
Harayçını əzaba, əziyyətə salarlar,
Tələbkarı çıxılmaz vəziyyətə salarlar...
Təlaşları eyləyib qəm əsiri onları,
Nəfəsləri varsa da, sanma diri onları.
Sözlərinə inanıb ixtilat qatmaq nədir?
Əgər kefli deyilsən, palçığa batmaq nədir?
Dağ kimidir hər biri, açsan əgər sirrini,
Səs verərək səsinə car eyləyər sirrini[2].
Sədaqətdən dəm vurub sirdaşına dönərlər,
Səndən bir şey qapınca hey başına dönərlər.
Təmənnadır yaradan elə əhdi-peymanı,
Allah kəssin qərəzli belə əhdi-peymanı.
Təmənnalı olarsa dostun, aman, dostluğu,
Düşmənçilik deməkdir dostun haman dostluğu.
İkibaşlı dostluğu dostluq sanma heç zaman,
Qərəzli dost-düşməndir, arxalanma heç zaman.
Dost da dostun eybini hünər sanan olarmı?
Dost daddığın zəhəri şəkər sanan olarmı?
Sadiq dostun sağaldar şəfasıyla yaranı,
Dönük dostun sızıldar cəfasıyla yaranı.
Bir-birinə isnişib həyan olan pişiklər,
Balasını istəkdən yeyən olan pişiklər.
Dost odur ki, dostunun gizli saxlar sirrini,
Zəmanətək faş eylər bu alçaqlar sirrini...
Firudinə bərabər sultan hanı cahanda?
Min ətiri duymağa imkan hanı cahanda?
Sirr saxlamaz qəlbində ər sirrini sirdaşı,
Öz qəlbindir dünyada hər sirrinin sirdaşı.
Ürəyinin sirrini faş eyləsə dil sənin,
Yad qəlbindən bir sirrin qala bilməz, bil sənin.
Könül elə sirdaşla gərək bölə sirrini,
Günəş kimi yaymağa hər gün çölə sirrini.

[1] Onlar zahirdə özlərini şam mumu kimi yumşaq göstərsələr də, daxildə ud ağacı kimi bərk, düyünlü-kinli, küdurətlidirlər.

[2] Dağa sirr açmaq olmaz. Çünki dağa bir söz deyən kimi onu əks-səda ilə, min səslə geri qaytarıb dünyaya faş edəcəkdir. Haman ikiüzlü adamlar sirr saxlamaqda dağ kimidirlər. Əgər biabır olmaq istəmirsənsə, onlara sirr açma.



Qəlbin nazik olmasa, hey sirrini açarmı?
Şüşə zərif olmasa, mey sirrini açarmı?[1]
Həyat nəyə gərəkdir bir həmdəmin olmasa?
İnsan çətin yaşayar dosta əmin olmasa...

## CƏMŞİDLƏ ÇAVAN YAVƏRİN HEKAYƏTİ

Sarayında Cəmşidin vardı yaxın yavəri,
Ay-Günəşin yavəri, o da şahın yavəri.
Comərdliyi hamını heyran qoydu sarayda,
Şah gözündə aləmin gözü oydu sarayda.
Etibarı, inamı şahın vardı tək ona,
Bütün könül sirrini şah açardı tək ona.
Hökmdarın gözündən cavan bir gün yox oldu,
Onun yoxa çıxması yaydan süzən ox oldu.
Al yanağı qüssədən sarı güldü o gəncin,
Şümşad boyu kamantək tez büküldü o gəncin.
Şahın sirri az qaldı oxtək dələ qəlbini,
Kimsə ala bilmədi onun ələ qəlbini.
O cavanla bir qarı üzbəüz gəldi bir gün,
Gördü lalə yanağı solub gəncin büsbütün.
Dedi: "Xəzan vurubdur, ah, bağında şümşadı,
Göz yaşları suvarır şah bağında şümşadı?!
Dərdin nədir, özünü saraltmısan belə sən?
Şad qəlbinin qanını qaraltmısan belə sən?
Qocalmısan gənclikdə, hüsnün solub nədəndir?
Yanağının laləsi xeyri olub nədəndir?
Sən yavərə bağlıdır şah qəlbi tək cahanda,
Qaş-qabağın açılsın şah qəlbitək cahanda.
Hüzurunda pörtərək hamı tökər tər şahın,
Ordusunda sirdaşı mühafizdir hər şahın".
Cavab verdi: "Döndərmə suya mənim qəlbimi,
Mümkünmü ki, biganə duya mənim qəlbimi?
Ürəyimə qüssəni dolduran da dözümdür,
Gül çöhrəmi saraldıb solduran da dözümdür.
Şahın mənə açıbdır hər bir zaman sirrini,
Saxlayıram qəlbimdə mən də haman sirrini,

[1] Şüşə içinə tökülmüş şərabı öz naziklik və şəffaflığı ucundan göstərdiyi, faş etdiyi kimi sənin də ürəyin öz nazikliyindən sirlərini açıb faş edir.

Elə ərin sirrini necə açım, mən necə?
Böyüklərin sirrini necə açım, mən necə?
Dinləmişəm can-başla mən həmişə sözünü,
Lal olmuşam salmayım dilə-dişə sözünü...
Damaq, dili altına alsa daha yaxşıdır,
İti xəncər qınında qalsa daha yaxşıdır.
Kim saxlasa dilini, görməz canı xatanı,
Dil gətirər başlara hər bəlanı, xatanı...
Fələk qanlı tasıyla yaxar gündə başını,
Qan tasına atmasın dil üstündə başını.
Bal suyuna susama, görsən sərin bulaq var,
Hər divarın dalında bir eşidən qulaq var.
Xoş ətridir üzdürən bənövşənin başını,
Kəsdirməsin xəncərlə dilin sənin başını...
Susan aşiq sükutla yar vəslinə qovuşar,
Təlaş nədir, təmkinlə öz əslinə qovuşar.
Nurlu könül sanma ki, inləməyə yaranmış,
Özü susur, özgəni dinləməyə yaranmış.
Bu dünyada dilini bilsə hərə könülün,
Öz dilidir tərcüman könüllərə könülün.
Nizamitək ürəyin şadsa əgər dünyada,
Dünya sənin deyilmi, söylə, məgər dünyada?!

### ON DOQQUZUNCU SÖHBƏT

## AXİRƏTİ QARŞILAMAQ

Bəzənibdir məclisi başdan-başa könülün,
Ay camalı nur saçır al qumaşa könülün.
Taxtındadır şah kimi, ətir yağır üstünə,
Şəkər səpib, ulduzdan çətir yağır üstünə.
Canlar alan amansız düşmənindir bu dövran,
Unutma ki, nə mənim, nə sənindir bu dövran...
"Mənəm-mənəm" deyəndir, bil ki, fələk bu yolda,
Quldur kimi hamıya qurar kələk bu yolda.
Əqrəb qədər qorxulu deyil hər an əjdaha?
Əqrəb səni öldürər udanacan əjdaha.
Kiçik düşmən ən böyük, ən vəhşətli bəladır,



Onu saya salmamaq ən dəhşətli bəladır...
Düşmən kiçik olsa da, can atandır qisasa...
Arifsənsə, unutma, əl qatandır qisasa.
Güclə yerin köksünü sökə bilər qarışqa,
Körpə şirin gözünü tökə bilər qarışqa...
Açsan üzə şərəflə hər bir zaman qapını,
Açacaqlar üzünə, bil ki, haman qapını.
Məsxərəylə kimsəni görsə gözün oyuncaq,
Olacaqsan dünyada axır özün oyuncaq.
Yaxşını da, pisi də izləyiblər hər zaman,
Yaxşı bil ki, pisləri pisləyiblər hər zaman.
Yaxşıların nişanı, əmanəti olubdur,
Pislərinsə zamini, zəmanəti olubdur.
Köçməlisən ya yaxşı, ya da ki pis, unutma,
Əməlinlə mələksən, ya da iblis, unutma.
Tikanlı gül tikanla anılıbdır həmişə,
Ənbərsatan ənbərlə tanınıbdır həmişə.
Saxta olma, köçəsən yer üzündən xəcalət,
Həm tanrıdan xəcalət, həm özündən xəcalət.
Bağrı közə döndərən dövrə yağdır nifrəti,
Qan çanağı fələyə, cövrə yağdır nifrəti.
Bu boyalı nazənin daş-qalağa layiqdir,
Vəfasına qələm çək, bil, talağa layiqdir.
Səkil Xətlan atını minib ucal fələyə,
Al qurğuşun qalanı, qələbə çal fələyə.
Qazansan da ən uca rütbəsini göylərin,
Oxutsan da şahlığa xütbəsini göylərin.
Səndə qalan deyildir elə zəfər bayrağı,
Yalnız mənə nəsibdir belə zəfər bayrağı.
Bir İnsanam, məqamım mələkdən də ucadır,
Can atdığım o dərgah fələkdən də ucadır.
Qamətimlə ölçülməz bir qiymətim var mənim,
Aləmimə bu aləm, yer də, göy də dar mənim.
Çay deyiləm, ümmanam, gör ki, nəyəm cahanda,
Zərrə deyil, tükənməz xəzinəyəm cahanda.
Fələk təki xəzinə üstündədir ayağım,
Əlçatmazam, bil ki, nə üstündədir ayağım.

## HARUN ƏR-RƏŞİD İLƏ DƏLLƏYİN HEKAYƏTİ

Tapdı harun dövründə növrağını xilafət,
Uca tutdu Abbasın bayrağını xilafət.
Yatağına qoyaraq gecə yarı xəlifə,
Rahatlandı hamamda gecəyarı xəlifə.
Dəllək onun başını kəliməyə başladı.
Kəlidliyi tük qədər ləliməyə başladı.
Qurtaranadək işini fürsət tapdı yenə də,
Söz atını minərək yersiz çapdı yenə də:
"Bir misilsiz ustayam, gəl, şad eylə məni sən,
Lap bu gündən özünə damad eylə məni sən.
Olsun hamı xəbərdar, kəsdir nigah qızına,
Bu bəndəni evləndir, qovuşum şah qızına".
Bu sözlərdən azacıq əsəbləndi xəlifə,
Yenə dözdü, sanma ki, qəzəbləndi xəlifə.
Dedi: "İsti bişirib, dözmür fağır dəhşətə,
Ya da zəhmim, vahiməm salıb ağır dəhşətə.
Çaşıb, yoxsa deyərmi alım sənin qızını?
Dəlləyə bax, istəyir xəlifənin qızını".
Başqa gün də sınadı Harun yenə dəlləyi,
Gördü lovğa, qudurğan, harın yenə dəlləyi.
Çox sınadı beləcə dönə-dönə yenə də,
Dediyindən dönmürdü dəllək yenə, yenə də.
Bir gədanın birisi gördü ki, nə danışdı,
Öz başına gələni vəzirinə danışdı:
"Haçandır ki, bir dəllək kələk açır başıma,
Bu oyunu bəlkə də fələk açır başıma
Olmalıdır söyləyir ona qızım adaxlı,
Bir abırsız dəlləyə sonra qızım adaxlı?!
Başım üstə qəzatək baş qatmaqdır peşəsi,
Gövhərimə, özümə daş atmaqdır peşəsi.
Əldə ülgüc, ağzında iti xəncər gəzər o,
Qılınc versən, başımı "uf" demədən kəsər "o".
Vəzir dedi: "Dili ki, belə atır dəlləyin,-
Ayağının altında xəznə yatır dəlləyin.
Haçan gəlsə yanına, o, hüzura bir daha,
Həmişəki yerində qoyma dura bir daha.
Əgər çıxsa əmrindən, asdırmağı unutma,



Harda durub oranı qazdırmağı unutma".
Dəllək, gəldi özünü yenə öyən kimicə,
Dəyişdirdi yerini vəzir deyən kimicə.
Qopan zaman yerindən ayaqları dəlləyin,
Birdən-birə saraldı yanaqları dəlləyin.
Gördü yoxdur dinməyə halı fağır ustanın,
Baxışından, dilindən, ədəb yağır ustanın.
Ayağının altında xəznə vardı bir zaman,
Surətini güzgüdə şah sanardı bir zaman.
Qədəmini xəznədən tez götürən gördülər,
Dükanını açaraq köks ötürən gördülər.
Ayağının altını tez qazıb nə tapdılar?
Haman yerdə tükənməz bir xəzinə tapdılar.
Qədəmini kim qoyub xəzinənin üstünə,
Söz incisi səpibdir daim sənin üstünə.
Hər tilsimi sındırar xəznəsilə Nizami,
Nurlu qəlbi, aynatək sinəsilə Nizami.

### İYİRMİNCİ SÖHBƏT

## VİCDANSIZLARDAN ŞİKAYƏT

Biz ki candan üzmüşük əlimizi dünyada,
Bu dünyaya bağlayan nədir bizi dünyada?
Bu torpağa uyduq ki, belə xarıq torpaqda,
Sanma necə varıqsa, elə varıq torpaqda[1].
Köçən köçüb, qalmışıq biz onlardan geridə,
Karvanımız qalıbdı karvanlardan geridə.
Bizimlədir həmişə iki mələk əzəldən,
Qurub insan oğluna iblis kələk əzəldən[2].
Üzü atəş, qəlbi buz ocaqçıya dönmüşük,
İsti külək, od olub sonra güya sönmüşük.

[1] Beytlərin mənası: Həyatının müvəqqəti olduğunu bil və insan kimi yaşa, dünya neməti və şan-şərəfi üçün özünü alçaltma. Dərk elədiyin həqiqəti de və həyata keçir. Sənin ömrünün çoxu gedib, ələyin ələnib, xəlbirin göydə fırlanır. Sən isə elə bilirsən ki, əbədi yaşayacaqsan. Ancaq yaşamırsan, sürünürsən.

[2] Əbədiyyət haqqında düşünməyərək bir anlıq dünyəvi ləzzət üçün o qədər pis əməllər görürük ki, şeytana tay oluruq.

Odlu ürək, alovlu gəncliyimiz hardadır?
Asudəlik, rahatlıq, dincliyimiz hardadır?...
Gülüş gül tək hamının dodağında solubdur,
Arzumuzun gülləri can bağında solubdur.
Sehrkartək can qurtar sən əlindən dünyanın;
Boşda qalsın əlləri əməlindən dünyanın.
Qan içəndir bu torpaq, qəfəsindən uç onun,
Zirək tərpən, qoynunda olmayasan puç onun...
Hünərini göstərsə əgər indi hünərli,
Hünərsizin birisi: mənəm-deyər-hünərli,
Hünərsizlər beziblər hünərsizlər əlindən,
Lap fərsizə dönüblər bu fərsizlər əlindən.
Əzabkeşin əzabı — bir tamaşa onlara,
Dəlilikdir düşünmək, haşa, haşa onlara.
Bir israfçı sanırlar səxavətli kəsləri,
Pulsuz kölə sayırlar sədaqətli kəsləri.
Comərdliyi hırıltı, lağlağılıq sanırlar,
Söz çeşməsi görəndə lehmə, ya lığ sanırlar...
Halına bax dünyanın, böyükləri kimlərdir?
Hanı ərlər, ərənlər, hünər əri kimlərdir?
Öz dövrünü alçaldan elələri var indi-
Dönüklükdən can atır olum eldə xar indi.
Şer — sənət göyündə bədirlənmiş ayam mən.
Bulud nədir, qoymaya öz nurumu yayam mən?!...
Haqsızlıqdan alışıb yanan olub ürəyim,
Alçaqları unudub, danan olub ürəyim.
Namərdlərin əlindən çox gəlmişəm cana mən,
Susmağımla çatmışam bu şöhrətə, şana mən.
Bir inciylə qulağa çatır səsi mücrünün,
Dolu olsa inciylə, batar səsi mücrünün.
Coşar, səsi kəsilməz şərabı az kuzənin,
Ağzınacan dolarsa, səsi çıxmaz kuzənin.
Aşıb-daşsa biliyin, dinməməyə alış sən,
Danışmağa çalışma, dinləməyə çalış sən.

## BÜLBÜL İLƏ QIZILQUŞUN HEKAYƏTİ

Güllər açan zamanda çəməndə, gül bağında,
Qızılquşa söylədi şeyda bülbül bağında:



"Cəh-cəhi var hər quşun, çıxarmırsan səs niyə?
Niyə üstün olmusan sən quşlardan bəs niyə?
Azad nəfəs alsan da, dilin bağlı həmişə,
Heyran qoyan deyildir səsin ağlı həmişə.
Yerin Səncər sarayı, peşən təklik olubdur,
Sinəsini sökdüyün daim kəklik olubdur.
Mənsə bircə ləhzədə görünməz bir xəznədən,
Çıxarıram yüzlərlə qiymətli dürr xəznədən.
Şikar vaxtı qurd-quşa var gümanım bəs neyçin?
Neyçin tikan üstədir aşiyanım, bəs neyçin?"
Cavab verdi qızılquş: "Dinlə, bacar susmağı,
Susmağımı görərək inlə, bacar susmağı.
Zirəklikdən almaram heç bir sirri dilimə,
Yüz iş görsəm, yenə də gəlməz biri dilimə.
Vurulmusan dövrana, coşursan, nə coşursan,
Solub gedən bir gülə min tərənə qoşursan.
Bu ovlaqda şikarçı mən tək kimdir əzəldən?
Kəklik döşü, şah əli nəsibimdir əzəldən.
Ötməkdən dilin yara, bağrın al qan olubdur,
Yemin qurd-quş olubdur, yerin tikan olubdur"
Firudinə şahlığın oxunanda xütbəsi,
Təbilləri susdurar bircə anda xütbəsi.
Xoruzların banıyla söküləndir hər səhər?
Bu vəfasız dünyaya hey güləndir hər səhər.
Biganədir fəryada, hər oyuna bu fələk,
Kəməndini dolayar hər boynuna bu fələk[1].
Nalə, fəryad qoparıb, olma cövrün əsiri,
Nizamitək olarsan sən də dövrün əsiri.

---

[1] Yəni fələk qışqırıb bağırmadığına, hay-küy salmadığına görə bütün varlığın taleyi onun əlindədir.

# XOSROV VƏ ŞİRİN

## KİTABIN TƏRTİBİ VƏ EŞQ HAQQINDA BİR NEÇƏ SÖZ

Ürəyin hatifi[1] görüb məni şad,
Hümmət eyvanından səsləndi: heyhat!
Durma, ey Nizami, iş zamanıdır,
Fələk etibarsız, dünya fanidir.
Təzə bahar yetir can çeşməsindən,
Yeni paltar geydir sözlərinə sən.
Hümmət eylə, burda ələ al sazı,
Ucalt bu pərdədə şirin avazı...
Məlum hekayətdir "Xosrov və Şirin",
Dastan yoxdur əsla bu qədər şirin,
Ruhu oxşasa da bu gözəl dastan,
Pərdədə qalmışdı bu gəlin çoxdan.
Tanıyan yoxdur bu gözəl alması,
Bərdədə var idi bir əlyazması.
O ölkənin qədim tarixlərindən,
Bu dastanı tamam öyrənmişəm mən.
O yerdə yaşayan qoca adamlar,
Təşviq etdi, işə mən verdim qərar.
Ağıl bu dastanı bəyənsin gərək,
Sözləri şirindir, məzmunu gerçək.
Xosrovdan, Şirindən qalan yadigar,
Gizlində deyildir, durur aşikar:
Şəbdiz atın şəkli, Bisütun dağı,
Pərviz sarayının eyvanı, tağı.
Zavallı Fərhadın sönən arzusu,

[1] Hatif — qeybdən gələn səs. Bu misrada səs mənasındadır.



O Şahrud, o çöldə axan gözəl su.
O qəsri — Şirinə gedən süd çayı,
Xosrovun ovlağı, zəngin sarayı.
On telli sazını çalardı Barbəd,
Şahrudda aramgah — xoş istirahət.
Söylərkən o həkim bu xoş dastanı,
Çıxarıb içindən eşqi, fəğanı.
Altmış yaşındaydı yazanda bunu,
Saxlaya bilmirdi yayda oxunu![1]
Altmışda sevginin, eşqin həycanı,
Titrədə bilməzdi yorğun qocanı.
Bilici deyəni etmədim təkrar,
Məlumu deməkdən kimə fayda var?!
Onun yazdıqları — cəngavər eşqi,
Mənim yazdıqlarım — bir dilbər eşqi.
Eşqdən başqa söz könlümə yaddır,
Ömrümün quşuna sevgi qanaddır.
Eşqdir mehrabu uca göylərin,
Eşqsiz, ey dünya, nədir dəyərin?!...
Eşqsiz olsaydı xilqətin canı
Dirilik sarmazdı böyük cahanı,
Eşqsiz bir adam bir neydir — qırıq,
Yüz canı olsa da, ölüdür artıq...
Köpək kimi yemək, içmək nədir, nə?
Bir pişik olsa da, can ver eşqinə!
Pişiyin eşqiylə yaşamaq, inan,
Yaxşıdır, şir olub, yalqız qalmaqdan.
Eşq düşsə daşın da qəlbinə əgər,
Gövhərdən özünə məşuq düzəldər.
Maqnit olmasaydı eşqin əsiri,
Çəkməzdi özünə dəmir zənciri.
Kəhrəbanın eşqə düşməsə canı,
Elə cəzb etməzdi quru samanı.
Dünyada gövhər var, daş var nə qədər -
Onlar nə bir şaman, nə dəmir çəkər.

[1] Nizami "bu dastanı söyləyən həkim" dedikdə Firdovsini nəzərdə tu-ur. Şair qeyd edir ki, Firdovsi "Şahnamə" əsərini yazanda 60 yaşında idi buna görə də "Xosrov və Şirin" hekayətindən danışarkən məhəbbətin, e-in fəğan və atəşini qabarıq şəkildə qələmə ala bilməmişdir.

Bu saysız-hesabsız maddələr yenə,
Bax gör, meyl edirlər mərkəzlərinə...
Kainatda hər şey cəzbə bağlıdır,
Filosoflar bunu eşq adlandırır...
İdrakı dinləsək, söyləyir o da:
Hər şey eşq üstündə durur dünyada.
Göylər yaransaydı eşqdən azad,
Düşün, olardımı yer üzü abad?...
Eşq ilə düzəltdim mən bu dastanı,
Doldurdum səsi ilə eşqin, dünyanı.

## "XOSROV VƏ ŞİRİN" DASTANININ BAŞLANMASI

Köhnə dastanların qoca ustadı,
Öz hekayətinə belə başladı:
Zaval gələn zaman Kəsra[1] bəxtinə,
Hürmüz sahib oldu şahlıq təxtinə.
O tez məşhur oldu ədalətilə,
Dolaşırdı adı hey dildən-dilə.
Öz ata yolunu tuturdu mətin,
Əl üstə — səxavət, ayaq üstə — din.
Nəslin ta itməsin qoca dünyadan,
Bir övlad istədi böyük xudadan.
Xeyli nəzir verdi, bir xeyli qurban,
Nəhayət, lütf etdi allah bir oğlan.
Övlad nə övladdı,-dəniz incisi,
Nurlu çıraqların ən birincisi.
Xoşbəxt doğulmuşdu, gözəldi bəxti,
Yaraşırdı ona tacı və təxti.
Atası görəndə istedadını,
Xosrov Pərviz qoydu onun adını.
Kimi görsə, sarılırdı boynuna,
Bu səbəbdən Pərviz dedilər ona...
Beşiyi tərk edib yeriyən zaman,
Ona öz canında yer verdi cahan.
Elə ki, beş yaşa çatdı, nə görsə,

[1] Kəsra — Sasanilər sülaləsinin qədim padşahlarına verilən ümumi ləqəbdir.



İbrət götürərdi baxıb hər kəsə.
Bəxti artırdıqca hər il yaşını,
Biliklə doldurdu o gənc başını.
Ayaq qoyan zaman yeddinci ilə,
Güllərə müşk saçdı gözəlliyilə...
Hər an tükü-tükdən seçirdi gözü,
Tük kimi zərifdi onun hər sözü.
Doqquzda tərk etdi oyun yolunu,
Şir üstdə sınadı güclü qolunu.
On yaşa girəndə bu nadir cavan,
Otuz yaşlıları qoyurdu heyran.
Şirlər pəncəsinə pəncə verərdi,
Qılıncla sütunu yerə sərərdi...
Kəməndlə on düşmən birdən tutardı,
Doqquz qarış boyda oxları vardı.
Ağ div olsa belə, onun oxundan,
Söyüd yarpağıtək əsərdi, inan.
Şimşək nizəsini çalsa daşlara,
Daşın ürəyində açardı yara.
O gündən ki, yaşı on dördü aşdı,
Biliyinin quşu qol-qanad açdı.
Könlündə hər şeyə maraq oyandı,
Dünyada yaxşını, yamanı qandı.
Büzürgümid adlı bir alim vardı,
Ağlı, istedadı gün tək parlardı.
Yeri qarış-qarış dolaşmışdı o,
Fikr ilə göylərə ucalmışdı o.
Göyün xəznələri açıqdı ona,
"Sirlər evi" desəm, haqdır, qoynuna.
Şahzadə xəlvətdə ona yanaşdı,
Hindi qılınc kimi dilini açdı.
Bilik dəryasına əl uzadaraq,
Cavahir istədi və aldı qoçaq.
Onun təlimindən könlü nurlandı,
Ondan bir çox hikmət öyrənib qandı...

## XOSROVUN ŞİKAR ZAMANI BİR KƏNDLİNİN EVİNƏ GETMƏSİ

Günlərin bir günü, bir səhər erkən,
Xosrov çıxdı çölə, könlü xeyli şən.
Ovladı, quşladı, çox atdı kəmənd,
Göründü uzaqdan səfalı bir kənd,
Kəndin hər tərəfi göldü, çəməndi,
Xosrov bu çəməndə atından endi.
Göyün sarı gülü gedənə qədər,
Kef edib qırmızı şərab içdilər...
Şahzadə o kənddə bir ev istədi,
"Bir məclis düzəlsin, kef edək" — dedi.
Əyləşib işrətə yoldaşlarilə
Açdılar səhəri əldə piyalə.
Ərqənun çaldırıb qulaq asdılar,
Ərqəvan mey içib oldular xumar...
Atlarından biri gün çıxan zaman,
Girib ot yemişdi göy bir tarladan.
Bir qurlu[1] qulam[2] da haman bu gecə,
Gedib qora dərdi bağdan gizlicə.
Günəş ki, aləmi parlatdı erkən,
Gecənin başını üzdü bədəndən...
Gözü götürməyən bir neçə nəfər,
Tələsik sultana apardı xəbər:
"Dünən gecə Xosrov əmri pozaraq,
Unutmuşdu şahun buyruğunu, bax!"
Şah dedi: "Bilmirəm günahı nədir?"
Dedilər: "Ey şahım, Xosrov zülm edir,
Atı kor qoymuşdur kəndin varını,
Qulu dərmiş bağın qoralarını.
Gecə bir yoxsulun evini almış,
Cəngi hər tərəfə gurultu salmış.
Şahzadə olmayıb, olsa yad adam,
Şah onun varını alardı tamam.
Yüz damarı kəsib çoxlu qan alan,

[1] *Qurlu* — Qur yer adıdır. Qurlu həmin yerdən olan adam.
[2] *Qulam* — qul.



Titrər əli alsa, öz damarından?"
Şah buyurdu, Xəncər çəkib getdilər,
Atın ayağını qələm etdilər[1].
Qora sahibinə verildi qulam,
Şoran sulanıldı gülabla tamam.
Xosrov kef çəkdiyi ev sahibinə,
Edildi Xosrovun təxti hədiyyə.
Qırdılar cənginin[2] dırnaqlarını,
Qopardılar cəngin tel qatarını...

## ŞAPURUN ŞİRİNİ TƏRİFİ VƏ XOSROVUN ONA AŞİQ OLMASI

Şapur adlı ona yaxın bir adam,
Məğribdən[3] Lahura[4] gəzmişdi tamam...
Zirək, şəkil çəkən, qələmi iti,
Xəyalən çəkərdi min bir surəti.
İncə, zərif işdə xeyli pərgardı,
Suların üstündə naxış salardı.
Pərvizin önündə öpərək yeri,
Söylədi dostuna bu xoş sözləri:
- Əgər şah əmr etsə, danışaram mən
Yüzdə birinicə bildiklərimdən.
Xosrov dedi: — Tez ol, de, ay cavan mərd,
Məclisi soyutma, qızışsın söhbət.
Söz söyləyən Şapur dilini açdı,
Rəngarəng sözləri min ətir saçdı:
- Aləm qulun olsun, dursa nə qədər!
Xoş keçsin ömründə aylar və illər!...
Dərbənd dənizinin[5] bir Şahmanında
Bir gözəl ölkə var dağlar yanında.
Şahzadə qadınlar orda hökmüran,
Yayılmış qoşunu İsfahanacan.
Arrandan başlamış Ərmənə qədər

[1] *Qələm etdilər* — kəsdilər.
[2] *Cənginin* — cəng çalanın.
[3] *Məğrib* — Qərb, günbatan.
[4] *Lahur* — hazırda Pakistanda şəhər adıdır.
[5] *Dərbənd dənizi* — Xəzər dənizi nəzərdə tutulur.

Onun fərmanına boyun əyirlər...
Tutub mal-qarası bütün dünyanı,
Quşdan və balıqdan artıqdır sanı.
Əri yoxdur, məsud dolanır özü,
Xoş keçir gecəsi, həm də gündüzü.
Şəmira adlanır o göyçək qadın,
Böyükdür mənası bu gözəl adın.
Cürətdə kişidən heç geri durmur,
Böyük olduğundan Məhin Banudur.
Gün keçib gələndə yeni bir fəsil,
O qurur özünə təzə bir mənzil.
Gül fəsli yamyaşıl Muğan — yatağı,
Yay zamanı yeri Ərmən torpağı.
Əkindən əkinə, çiçəkdən gülə,
Gəzir, seyrə çıxır hey gülə-gülə.
Yay ötüb keçəndə, payız gələndə,
Abxazda ovları salır kəməndə.
Bərdənin havası çox mötədildir[1],
Hər il qış zamanı o bura gəlir...
Bu zindana bənzər dünyada ancaq,
Qardaşı qızıdır gözünə çıraq.
Sanki bir pəridir, pəri yox bir ay,
Qəhrəman bir qızdır başda kələğay.
Dirilik suyudur gözü — qapqara,
Gecəni qərq edir ay tək nurlara.
Hündür boyu — gümüş xurma ağacı,
Xurma dərən bir cüt zəncidir saçı...
Ölkədə tanınmış nadir gözəllər,
Fərman gözləyirlər yanında yeksər.
Ay tək kübar qızlar — düz yetmiş nəfər,
Ona gecə-gündüz xidmət edirlər...
Onlara toxunmaz deyə bəd nəzər,
Üzlərinə əsla niqab örtməzlər.
Əfsanəyə bənzər o çöl, o çəmən,
Bəzənib nar döşlü şux sənəmlərdən...
Behişt huriləri tapsa da şöhrət
Onlar huridirlər, bu yersə cənnət.

[1] *Mötədil* — mülayim.



**O yerin sahibi Məhin Banudur,**
**Dövlətin, sərvətin sahibi odur.**
**Bir at bağlanıbdır sərtövləyə tək,**
**Onun tozuna da çatmaz heç külək.**
**Xəyaldan tez gedər qalxsa dördnala,**
**Qorxmur sona kimi tufandan əsla.**
**Yerindən sıçrasa günəşə sarı,**
**Yeddi qatlı göydən qalxar yuxarı.**
**Qalar dırnağının daşlarda izi,**
**Bambuq quyruğuyla yarar dənizi.**
**Səhərtək oyaqdır, xəyal yerişli,**
**Gecətək huşyardır, zaman gərdişli.**
Rəngi şəvə rəngi, Şəbdizdir adı,
Şirin ishaq kimi sevir o atı.
Ayaqlarında var qızıl zənciri,
O qızıl zəncirin olmuş əsiri.
Nə Şirindən şirin insan mən gördüm,
Nə Şəbdizdən qara bir köhlən gördüm.
Elə ki, söz bitib Şapur dayandı,
Rahatlıq uyudu, sevgi oyandı...
Xosrov bu söhbətdən narahat oldu,
Qəlbi sevda ilə, həycanla doldu.
Bütün günü onu düşünürdü hey,
Yoxdur xəyalından ondan başqa şey...
Çağırıb Şapuru xəlvətə özü,
Düşdüyü sevdadan başladı sözü.
Dedi: — Ey cavan mərd, vəfalı yoldaş!
Mənim dadıma yet, ol mənə sirdaş!
Gözəl özül qoydun, sözüm yox buna,
Ustad kişisənsə işi vur sona.
**Şəkər adı çəkmə, sözü qısa et!**
**Şəkər söylədinsə Xuzistana get!...**
**Naxış götürənsə mum kimi əgər,**
**Möhrümü vur ona, göstər bir hünər.**
**Dəmir ürəklisə xəbər yetir də**
**Ki, soyuq dəmiri döyməyim bir də.**

## ŞAPURUN ŞİRİNİ AXTARMAQ ÜÇÜN ƏRMƏNƏ GETMƏSİ

O söz bilən Şapur yeri öpərək,
Dedi: "Xosrov daim şad olsun gərək.
Uğurlar istəyən olsun uğurlu!
Uğruna çıxmasın pis gözün yolu".
Hünərli şahına "afərin" deyib,
Söylədi: "Ey böyük dünyaya sahib!...
Qəm yemə, şadlıqla yaşa, ol aram,
Çalışıb bu işə çarə taparam.
İşimdə bir an da yubanmayaraq,
Quşdan qanad allam, ceyrandan ayaq.
Səni yatırmamış yatmaram bir an,
Sevgilin də sənə yetişər, inan!...
Görsəm gücüm çatmır işə, çaparaq,
Şaha bildirərəm yubanmayaraq".
Şapur belə deyib durdu ayağa,
Hazırlıq başladı yola çıxmağa...
Yolda o nə yatdı, nə də dincəldi,
Şirinin yanına bir aya gəldi...
Şapur gələn zaman körpəydi otlar,
Hər yan xoruzgülü, lalə və gülzar.
Güllər içindəydi mavi qayalar,
Min rəngə çalırdı orda ilk bahar.
Dağların başında zümrüddən xalı,
Heyran eyləyirdi fikri, xəyalı...
Qart daşdan tikilmiş bir kilsə vardı,
Orda bir qoca keşiş yaşardı.
Dərviş qılıncında gedib Şapur da,
Düşərgə salaraq dayandı orda...

## ŞAPURUN ÜÇÜNCÜ DƏFƏ XOSROVUN ŞƏKLİNİ GÖSTƏRMƏSİ

Gecənin qoynundan çıxınca səhər,
Qızıldan tac qoydu başına göylər.
Firuzə taxt üstə süfrə sərildi,
İçki məclisinə şərab verildi...



O naxış çəkən də gəldi gülşənə,
Xosrovun şəklini yaratdı yenə.
O pəri, bu yeri görüb xoşladı,
Pəri üzlülərlə kefə başladı.
Yenə şəkli gördü, həsrətlə baxdı,
O surət könlnü yandırdı, yaxdı.
Bu hiylədən onu bir heyrət aldı,
Oyunu unutdu, çox fikrə daldı.
Qoşdu arzusuna, kefi unutdu,
Götürüb surəti əlində tutdu.
Baxıb bu aynada gördü özünü,
Görüb bihal oldu, yumdu gözünü...
O bütlərə baxıb Şirin səsləndi:
"Bu şəkildən ötrü səbrim tükəndi.
Gizlətməyək bunu kimsədən gərək,
Onun sağlığına gəlin mey içək".
Kefə başladılar qızlar yenidən,
Gülgün şərablarla bəzəndi çəmən.
Başlandı saz, qəzəl, hicran nəğməsi,
Yüksəldi saqinin "Nuş olsun!" səsi.
Şirin əlində təlx şərab tutunca
Acı və şirindən məst oldu dünya.
Dəyəndə Şirinin meyə dodağı,
Şəklin qabağında öpdü torpağı.
Sərxoşluq salanda məşuqu dara
Səbri kəsilərək axtardı çara.
Qızlardan birini göndərdi ki: "Sən
Yoldan ötüb keçən hər kimi görsən,
Göz qoy, soruş, öyrən haradır səfər.
Şəkil barəsində tut ondan xəbər".
Qızlar gizlin, açıq hey soruşdular,
O surətin sirri olmadı aşkar.
Şirin iztirabdan heç dincəlmədi,
Şəkildən bir doğru xəbər gəlmədi.

## ŞAPURUN ÖZÜNÜ ŞİRİNƏ GÖSTƏRMƏSİ

Əfsunçu xəlvətdən çıxdı qəflətən,
Atəşpərəst kimi parladı birdən.

Şapurun üzündə Şirin özünə,
Bir məhrəmlik gördü, baxdı gözünə.
Pis təsir etmədi Şirinə Şapur,
Hiss etdi surətdən xəbərli budur.
İşarə eylədi: "Çağırın gəlsin,
Yesin, içsin, bir az burda dincəlsin.
Bəlkə bu şəkildən verdi bir xəbər,
Hansı məzhəbdəndir? Kimdir? — Söyləyər".
Kənizlər ətəklə yolu süpürüb,
Şəkli soruşdular Şapuru görüb.
Şapur dedi: "Bu dürr asan deşilməz,
Belə ayaq üstə deməyə gəlməz".
Xam saysınlar deyə bu işdə onu,
Şapur dodaqaltı dedi əfsunu.
"Onun ayağını görüncə torda,
Sakit davranmağı fərz bildi orda.
Xidmətçilər qaçıb Şirinə sarı,
Nəql etdilər Şapur buyuranları.
Şirin eşitdikdə belə bəyanı,
Qızışdı, dayandı bağrında qanı...
Uzaboylu pəri, mələküzlü qız,
Şapurun yanına gəldi aramsız...
O duzlu dodaqlar, nazlı baxışlar,
Şapuru səslədi, dindi biqərar.
Şirin dedi: "Bir an aşinalıq et,
Həmsöhbət ol mənə burda bir müddət".
Bu sözü hiyləgər Şapur eşitcək,
Öz-özünə dedi: "Dayanım gərək".
O nərgiz gözlərin dilini bilən,
Hər nəyi vardısa, itirdi birdən.
O, pəri üzüylə min tərif dedi,
Pəri də Şapura "əyləş" söylədi.
Şirin soruşdu ki: "Kimsən, nəçisən?
Aşinalıq iyi duyuram səndən".
Ona cavab verdi o püxtə adam:
"Yaxşıya, yamana çox rast olmuşam.
Allah açmış mənə bu göyü, yeri,
Məndən gizlətməmiş o heç bir sirri.
Balıqdan Ayatək bu yer bir yana,



Nə mənə vardısa vaqifəm ona.
Məşriqdən başlamış Məğribə qədər
Bu böyük dünyanı gəzmədim hədər".
Şapurda cəsarət görüncə Şirin,
Soruşdu: "Mənası nədir bu şəklin?"...
Dedi: "Bu gördüyün pak üzlü insan,
Düz yeddi iqlimə olub hökmran...
O, şahlar şahıdır, Xosrov Pərvizdir,
Şahənşahlıq ondan qüvvət kəsb edir".
Şapur bu sözlərdən dedi bir qədər,
Şirinin canına yayıldı sözlər...
Sirrini açmağa verərək qərar,
Şapur sözü ona söylədi aşkar:
"Sözü gizlədirsən, ey pəri üzlü,
Sözünü pəritək deyirsən gizli.
Neçin öz içində gültək gülürsən?
Sözü şəkər kimi açıq söylə sən.
Dərman istəyirsən dərdinə əgər,
Gizlətmə, dərdini təbibə göstər".
Şapurun sözündən o qeyzə gəldi,
Onun hirslənməsi necə gözəldi!...
Söylədi: "Ey abid, indi, sən allah,
Kömək elə, sənə gətirim pənah!
Mən düşdüyüm bu iş xeyli çətindi,
Saçımtək dolaşmış fikrim də indi...
Sirrimi söylədim sənə mən açıq,
Sən də sirrini de, gəl meydana çıx".
Bu sayaq görüncə əhvalı Şapur,
Düşündü: "Doğrunu demək xoş olur!"
Qolunu qolbaqtək əvvəl öpərək,
Ayağına düşdü qızıl xal-xaltək.
And içdi, dedi: "Ey göylərin şamı!
Təxtə layiq gözəl, şahlar ilhamı!...
Nəqqaşlıqda böyük yerə çatmışam,
Xosrovun şəklini mən yaratmışam.
Rəssam çəkən şəklə oxşayır, fəqət,
Cansız olur onun çəkdiyi surət.
Surət çəkmək — mənə məlumdur bu iş,
Can paltarı başqa yerdə tikilmiş.

Sən onun şəklinə vuruldun belə,
Özünü görəndə neylərsən, söylə?
Orda nurdan doğmuş dünya taparsan,
Gözlərin nurudur, özü də cavan.
Maraqlı, zirək və ayıq igiddir,
Ülfətdə ceyrandır, qəzəbdə bir şir.
Bir güldür ki, hələ görməmiş xəzan,
İlk bahar gəncliyi öyrənmiş ondan...
Bir ətri cənnətə yüz qapı açar,
Ay gözəl üzündən utanıb qaçar.
Atı yəhərlədi — Rüstəm kimidir,
İçərkən görənlər Keyqubad bilir...
Qızıl versə — saysız dəvə gərəkdir,
Qılınc çəksə — daşlar vay görəcəkdir...
O, nə şərab içir, nə də danışır,
Yatmır gecə-gündüz, yanır, alışır.
Şirindən başqa bir həmdəm istəməz,
Belə bir qüssəyə batmasın heç kəs.
Bundan ötrü məni qasid göndərmiş,
Mən söylədim, indi səndədir hər iş".
Burda inci deşdi Şapur cürbəcür.
Bildiyini dedi, artıq bitdi dürr.
Bu sözşərdən Şirin sərxoş olmuşdu,
Sözləri şərbəttək könlünə nuşdu.
Az qaldı yıxılsın orda yüz kərə,
Birtəhər dayandı, düşmədi yerə.
Şapura söylədi: "Ey adil kişi,
Necə başa vuraq indi bu işi?
Bələd ol, göstər sən mənə yol, yolaq,
Bəlkə yardımınla qəmdən qurtulaq.
Mən də bu kədərdən cana gəlmişəm,
Həsrət, intizardan xəstələnmişəm."
Şapur dedi: "Sən ey günəşdən gözəl,
Qəlbini qayğıdan kənar saxla gəl.
Sirrini məbadə deyib-açasan,
Sabah ov adıyla gərək qaçasan.
Şəbdizə kişitək minib çaparaq,
Ova çıx, ovlaqdan qaçarsan ancaq.
Ətəyini tutan olmayacaqdır,



Şəbdiz ata çatan olmayacaqdır.
Sən səyyarə kimi mil-mil uzaqlaş,
Bacarsam, gələrəm ardınca birbaş."
Xosrov göndərdiyi üzüyü verdi,
"Al" — dedi, üzünü ona çevirdi:
- Yolda təzə şaha rast gəlsən əgər,
Onda bu hilalı sən ona göstər.
Xosrovun köhləni qızıl nallıdır,
Paltarı daş-qaşlı, cah-cəlallıdır.
Papağı, donu ləl, kəməri ləldir,
Üzü ləl, üstü ləl, özü gözəldir.
Görməsən, Mədain yolunu tut, get,
Şah qəsrini soruş, o mənzilə yet.
Gəlib Mədainə çatdığın zaman,
Xəznələr üstündə xəznə taparsan...
Banuya söylədi Şirin: "Cahangir!"
Könlüm sabah ova çıxmaq istəyir.
Lütf edib göstərin icazənizi,
Buyurun, sabahlıq minim Şəbdizi.
Dolaşım belində çölü-çəməni,
Burda görərsiniz siz axşam məni".
Məhin Banu dedi: "Ey gözəl afət,
Gəl atı istəmə yüz mülk tələb et!
Çünki qaçağandır yaman bu Şəbdiz,
Cilovunu yığmaq olmayır hərgiz.
Qorxuram sürətdən və hərarətdən,
Atəş su altında coşar gedərkən[1]."
Əgər onu minmək iştiyağın var,
Gecə aydan əziz deyil, al apar!
Başına pəhləvan yüyəni keçir,
Sürüb öz altında öyrət onu bir".
Gül üzlünün üzü açıldı gültək,
Banuya baş əydi yeri öpərək.

[1] Nizami bu beytdə Şirini lətafətdə suya, Şəbdizi oda bənzətmişdir. Beytin mənası: qorxuram qızğın at baş alıb səni (Şirini) qaçırar.

## ŞİRİNİN OVA GETMƏSİ VƏ ORADAN MƏDAİNƏ QAÇMASI

Elə ki, bir səhər Çin xəznədarı,
Zər qıfılla örtdü göy qapıları,
O çin nəqşi çıxdı sandıqdan çölə,
Yola hazırlaşdı şad gülə-gülə...
Belə adət vardı ova gedənlər,
Oğlan paltarında gedərdi yeksər.
Şirin dövrəsində halqa vurdular,
Atların belinə bir oturdular.
Saray həyətindən çıxdılar çox şad,
Həyat suyu içmiş Xızrtək azad.
Çöldə atlarını sürüb getdilər,
Dağlardan aşdılar, çölə yetdilər.
Sonra at səyirdib, cıdır qurdular,
Cilovu buraxıb atı vurdular.
Şəbdiz belindəydi qoşun sındıran,
Özü miniciydi, atı qaçağan.
At qızışdı, onun dəyişdi halı,
Kənizlər Şirindən düşdü aralı.
Dedilər yəqin at cilov aparır,
Bilmədilər könül bir ov aparır.
Kölgətək ardınca yüyürdülər çox,
Gördülər tozundan belə əsər yox.
Axtardılar gecə yarıya qədər,
Ümid qalmayanda geri döndülər...
Elə ki, Banu bu xəbəri aldı,
Köhnə dərd-qəmini yadına saldı.
Təxtdən düşdü yerə çox qəmli-qəmli,
Başı torpaqlarda, gözləri nəmli.
Qəmindən başını o qucaqladı,
Tökdü göz yaşını, yaman ağladı...
Bu işi yuxuda görmüşdü çoxdan,
Qolundan uçmuşdu bir tülək tərlan.
Həsrətlə baxmışdı uçan tərlana,
Tərlan qonmuş idi yenə qoluna.
Adamlara dedi: "Onun dalınca,
Ley kimi uçsaq da bicadır, bica.
Yer deyil göyləri axtarsaq da biz,



Şəbdizin tozundan tapmarıq bir iz.
Uçmuş quş ardınca olarmı getmək?
Tələ görmüş ovu qovmaq nə gərək?..."
O yanda Şəbdizin belində Şirin,
Ölçürdü dünyanı cavan Pərvizçin...
Paltar geyinmişdi kişilər kimi,
Düzlərdən keçirdi qoçaq ər kimi...
Yolda yorulmuşdu olduqca Şirin,
Qonmuşdu üzünə tozu çöllərin.
Atını o yeltək çapdığı zaman,
Arxada qalırdı toz dağtək, ondan.
On dörd gün at sürüb soraq edirdi,
On dörd günlük aytək o yol gedirdi...
Cana birdəfəlik cəfa verərək,
Atını sürürdü Şirin yüyürək.
Gördü behişt kimi xoş bir çəmənzar,
Dirilik suyutək bir çeşmə də var.
O parlaq çeşmənin suyunu görüb,
Gedib abi-həyat zülmətə girib.
Şirinin bədəni yorğundu xeyli,
Başdan-başa tozdu sifəti, əli.
Çeşmə ətrafını gəzdi bir zaman,
On ağaclıqda da yoxdu bir insan.
Atdan endi yerə, atı bağladı,
Bildi görməz onu insan övladı.
Nur çeşməsi gəldi, suya yanaşdı,
Uzaqdan göylərin gözü qamaşdı.
Şəkər paltarını Süheyhl çıxartdı[1],
Göyün Şərası da fəryad qopartdı.
Mavi rəngli fitə bağladı Şirin,
Girdi suya, yandı bağrı göylərin...

## ATASINDAN QORXUB QAÇAN XOSROVUN ƏRMƏNƏ GƏLMƏSİ

...Mindi dağ heykəlli atın belinə,
Üz tutdu Xosrov da Ərmən elinə.

[1] Beytdə işlədilən "Süheyl", "Şəra" ulduz adlarıdır. Beytin mənası: Şirinin ağ bəənin görcək Şəra ulduzu həsəddən fəryad qopardı.

Qəlbi qorxu, kədər, qəmlərlə dolu,
Bir edirdi iki mənzillik yolu.
Şirin çimən yerdə onlar nagəhan,
Gördülər ki, atlar yorulmuş yaman.
Xosrov əmr eylədi qullar dayansın,
Köhlənlər yemlənsin və tumarlansın.
Ayrılıb qullardan Xosrov kənara,
Getdi yavaş-yavaş o çəmənzara,
Fırlandı firuzə rəngli bağçanı,
Bir çeşmə gördü ki, güldü hər yanı.
Orda bir tovuztək qartal oturmuş,
Kövsər kənarında qırqovul durmuş.
Göy otun üstündə yavaş gedirdi,
Öz-özünə belə fikir edirdi:
"Əcəb olardı bu büt mənim olsa,
Ya da bu at mənim köhlənim olsa".
Bilmirdi, həm o at, həm o şux mələk
Onun sarayına bir gün gələcək.
Məşuqə qapıya gələndə sərxoş,
Aşiq onu görməz, vaxtı keçər boş.
Yol üstündə dövlət durar çox zaman,
Azar yolu o gün bixəbər insan.
Xosrov baxdı, nurdan gözü qamaşdı,
Birdən gözü orda Aya sataşdı.
Bir az baxdı, ona üsəndi canı,
Titrəməyə düşdü, üyüşdü qanı.
Gördü o yerdə var təzə bir qəmər.
Dedi: "Ayın yeri olmalı ülkər".
Ay deyil, cilvəli bir ayna-gümüş,
Cilvədən bir Nəxşəb ayı tökülmüş[1].
Gül kimi göy rəngli suda oturmuş,
Göbəyinə mavi bir fitə vurmuş...
Qapqara buluddan ay çıxan zaman,
Şirin şahzadəni gördü uzaqdan...
Şahın baxışından utandı Şirin,
Titrədi sulara düşmüş ay təkin.
O şəkər tapmadı başqa bir çarə,

[1] Əfsanəyə görə Müqənnə adlı bir sehrkar Naxşəb şəhərində dəmirdən bir ay düzəldib. Gecələr bu ay quyudan çıxıb ətrafı işıqlandırırmış.



Bürüdü ay üzün qara saçlara.
Ənbərlə bəzəyib ayın üzünü,
Gecəylə örtürdü öz gündüzünü...
Şah imkan yaratdı o aya bir az,
Gecavəsiz gəlin aparmaq olmaz.
Pəri çıxıb sudan quş tək silkindi,
Paltarını geyib Şəbrizi mindi.
Dedi öz-özünə: "Bu gənc kimdir, kim?
Fələk tək dövrəmdə fırlanır mənim.
Heyrət!... Əgər deyil sevgilim bu şəxs,
Görüncə qəlbimi niyə verdim bəs?...
Xosrovun geyimi ləldir deyirlər,
Bəs o nişan hanı, dildarsa əgər?"
Bilmirdi ki, səfər edərkən şahlar,
Ehtiyatdan geyir başqa cür paltar...
Ağıl dedi: "Döndər üzünü, bəsdir,
İki yana namaz qılmaq əbəsdir.
Bir dövranda bir cüt badə içilməz,
Bir bəndəyə iki ağa seçilməz.
O şah olsa belə bu gözəl cavan,
Bunu soruşmazlar bu yerdə ondan...
Öz qara quşunu səyirtdi getdi,
Nal səsi balıqla öküzə yetdi.
Səba yelindən də yeyin qaçan at,
Qaçmaqda fələyi eyləmişdi mat.
Sürətdə çatmazdı o ata pəri,
İzini görməzdi divin gözləri.
Bir an sonra Xosrov baxdıqda geri,
Görmədi o yerdə heç bir nəfəri.
O yana, bu yana atını sürdü,
Nə dili, nə də ki, dilbəri gördü[1].
Çeşmə ətrafında gəzdi bir qədər,
Tapmadı gövhərdən orda bir əsər...
Həsrət qalıb Xosrov o şux tərlana,
Baş götürüb getdi Ərmənistana.

[1] *Dil* — ürək, *dilbər* — ürəyi ələ alan.

## ŞİRİNİN XOSROVUN SARAYINA YETİŞMƏSİ

Düzəltmək istəsə bir işi fələk,
Əvvəlcə min oyun çıxartsın gərək.
Xəznə vermiş olsa bir əkinçiyə,
Gərək o əkinçi əvvəl inciyə.
Həyatın yolunda olmasa tikən,
Olarmı güllərin qədrini bilən?
Bir neçə gün hicran dağıyla tək qal,
Ayrılıqdan sonra xoş olur vüsal.
Ayrılınca Şirin orda Xosrovdan,
Yaxınlıqdan ona üz verdi hicran.
Hər gün soraqlayıb Xosrov Pərvizi,
Mədain Qəsrinə sürdü Şəbdizi.
Tərk edib gəlinlik adətlərini,
Gəlintək gəzirdi sanki ərini.
Verdi kənizlərə özünü nişan,
Bəxş eylədi bağa bir sərvi-rəvan.
Şirinin üzünü görən kənizlər,
Dodaq dişlədilər həsədlə yeksər.
Gəlmiş kimi hamı şah hüzuruna
Hörmət eylədilər Xosrovtək ona.
Dedilər: "Xosrovun düzdür imanı,
Tapmışdır belə bir könül yaxanı.
Bir işıq gətirdi sübhə bərabər,
Onun atəşiylə yandı ürəklər".
Hal-əhval tutdular sonra qonaqdan,
Dedilər ki, "Göstər, bizə ver nişan:
Kimsən, haralısan, de adın nədir?
Sən hansı yuvanın quşusan, de bir?"
Pəri üzlü Şirin utandı bir az,
Belə yerdə əlbət yalansız olmaz.
Dedi: "Macəramı desəm çox çəkər,
Qoy qalsın ta Xosrov gələnə qədər.
Qayıdıb gəlincə Xosrov səfərdən,
Agah edər özü sizi xəbərdən.
Yaxşı baxın ancaq bu qara ata,
Dəyər bir xəzinə cəvahirata".
Elə ki, sözünü dedi o gövhər,



Yüz nazla oturtdu onu kənizlər.
Ay üstünə gülab səpdi hər kəniz,
Şahlıq axuruna bağlandı Şəbdiz...

## XOSROVUN ATASINDAN QAÇMASINDAN ŞİRİNİN XƏBƏR TUTMASI

Mədaində Şirin gözləyir vüsal,
Şirin dodağından axıdırdı bal.
Bir ay səbr eylədi, çəkdi intizar,
Sonra da Xosrovdan oldu xəbərdar.
Bildi, qorxub şahdan, ova getmişdir,
Ərmənlərə tərəf səfər etmişdir.
Çarəsiz ürəyi dərdləndi yaman,
Yoxdu bu dərdinə əlbəttə, dərman.
Bir neçə gün əsla evdən çıxmadı,
Elə bil sınmışdı qolu, qanadı.
Bir acı həqiqət açıldı ona —
Bildi Xosrov imiş çıxan yoluna.
O imiş yoldakı — qəlbini yaxan,
Günəş kimi durub hey aya baxan.
Vurdu öz başına iki əliylə,
Peşman oldu artıq, gəlmədi dilə.
Belə bir neçə gün səbr etdi, durdu,
Sonra kənizlərə işarə vurdu.
Dedi: "Dağ ətəyi səfalı, təmiz,
Bir yerdə tikdirin mənə qəsr siz.
Gül içrə böyümüş bir dağlıyam mən,
Al gülüm saralmış belə istidən".
Mehriban bir gözəl dedi gülərək:
"Ey gözəllər şamı, ərimə şam tək,
Başçımız səninçin sərin, havalı,
Yer düzəldin, deyib, gözəl, səfalı.
Əmr etsən deyərik usta sənətkar,
Dağlıqda səninçün bir qəsr hazırlar".
Dedi: "Şahlar şahı buyuran sayaq,
Bir qəsr tikdirin, tez olsun ancaq"...

Bu yer gözəlliyin gülünü vurdu".
Bu dedi: "Belə yer ərmənistandır,
O yerin gözəli dildə dastandır".
Biri dedi: "Kəşmir marallarından,
Tapan olmamışdır hələ bir nöqsan".
Biri dedi: "Şahım lütf etsə əgər,
İsfahanda vardır bir nazlı Şəkər.
Şirin söhbətləri qəlbi şad edir,
Xuzistan şəkəri ondan dad edir.
Yüz gülüş gizlənib al dodağında,
Şəkəri qul edib bal dodağında.
Sərvi heyran edib bütün çəməni,
Yasəməndən ağdır gümüş bədəni.
Ağzının yanında xurma nə şeydir?
Qapısında şəkər nökərlik edir.
Niqabı götürsə üzündən həmən,
Yüz Yusif səslənər quyu dibindən..."
Bu tərif Xosrovun xoşuna gəldi,
Eşqi cuşa gəldi keyfi kökəldi.
İstədi atını üstünə salsın,
Türk kimi hücumla üstünü alsın.
Bu qənd şirnisini aparsın o qənd,
Bu bəndi bağlasın, açılsın o bənd.
Gövhəri gövhərlər qiymətdən salar,
İpəyti ipəklər hörmətdən salar.
Məqsədi alverdi, bazarı şəkər,
Şəkərdə də vardır şirindən əsər.
Nə unuda bilir şəkər ağrısın,
Nə layiq bilirdi onu çağırsın.
Bir il səbr elədi, qaldı bu sayaq,
Bir kimsə bilmədi bu sirri ancaq.
Bir il sonra qalxdı qulamlarıyla,
İsfahan tərəfə düzəldi yola...
Xosrov həm coşqundu, həm də həvəsli,
Şirinin qəsri var, şəkərin vəsli.
Xosrov yavaş qapı döydüyü zaman,
Sırğalı bir qulam çıxdı qapıdan.
Bu gözəl cavanı görəndə qulam,
Anladı ki, şahdır gələn bu adam.



Xosrovu ay kimi atdan düşürdü,
Şəbdizi bir anda otlağa sürdü.
Qonağı apardı nazla eyvana,
Bu fəxrdən başı çatdı Keyvana.
Büsat açdıraraq Xosrov oturdu,
Qızıl xərc elədi xoş məclis qurdu.
İcazə verdi ki, qoy gəlsin Şəkər,
Başlansın xoş sözlər, şirin söhbətlər.
Gülab dolu camla gəldi o nigar,
Ağzı şəkər dolu, gözləri xumar.
Adı Şəkər, özü şəkər o idi,
İsfahanda nabat məgər o idi?
Saçından ətrafa səpirdi ənbər,
Gülüşü qənd idi sözləri şəkər...

## XOSROVUN ŞƏKƏRİ ALMASI

Od kimi yananda şərq üfüqləri,
Su kimi tərk etdi Xosrov o yeri.
Yığdı İsfahanın böyüklərini,
Soruşdu onlardan o şux pərini.
İsfahanın əhli ta bir ağızdan:
"İsmətlidir, — dedi, — o afəti-can"...
Mədainə tərəf yola düzəldi,
Şəkər də onunla bərabər gəldi.
Şəkər səbəbinə alçaldı Şirin,
Şəkər də özünü salırdı şirin.
Doyan zamanda şah Şəkərdən yenə,
Üz qoydu Şirinin o bal şəhdinə.
Şəkər şah qəsrində yalqız qalırkən,
Şirin xurmasından yeyirdi tikan.
Şirinin eşqiylə hey çəkərək ah,
Suda şəkər kimi əriyirdi şah.
Şirin həsrətindən şah olmuşdu şam,
Odlarda yanırdı hey səhər-axşam...
Şəkərlə Şirinin fərqi əyandır,
Şəkər can yeridir, Şirinsə candır.
Şirin — kəcavədə oturmuş pəri,
Şəkər — onun ipək pərdədə zəri.

Ürəyi deyirdi: tez gəlsin Şirin,
Bir faydası yoxdur mənə Şəkərin.
Buza çatmazsa da saflıqda büllur,
Büllur quru, ancaq buzsa yaş olur.
Başımda fırlansa dəyirman daşı,
Şirindir könlümün yenə sirdaşı.
Dolanıb başına dönmərəm ondan,
Bir başım var, verdim yolunda qurban.
Dedi: "Bütün bunlar bir xam xəyaldır,
Səbr etməsəm bu iş xeyli mahaldır"...

## ŞİRİNİN YALQIZ QALIB AH-ZAR ETMƏSİ

Xosrov bilirdi ki, həmişə Şapur,
Şirinin dərdini yaxşı ovudur.
Daha da darıxsın, deyərək, Şirin,
Əmr etdi ki Şapur dərgaha gəlsin.
Şirin öz qəsrində qalan zaman tək,
Yaş tökdü gözündən parlaq ləltək.
Bir gecə qəlbini çox sıxdı kədər,
Olmuşdu gecəsi ilə bərabər.
Gecə qaranlıqdı. Dağın üstünə,
Sanki qara qarğa qonmuşdu yenə[1]
Dağ asılmış kimi qanadlarından
Ağır tərpənirdi o qarğa yaman.
Buz kimi soyuqdu gecənin üzü,
Sanki bu gecənin yoxdu gündüzü.
Sanki səhər quşu çəkilmiş dara,
Batmışdı hər tərəf qaranlıqlara.
Təbilçi əlini vurmuşdu ilan,
Ulduz ayağına batmışdı tikan[2]...
Səbrindən xoruzlar qanadlandılar,
Dedilər: səbr edən məqsədə çatar.
Yerə sürtdü Şirin o gül üzünü,

[1] Qara qarğa dedikdə gecənin qaranlığı nəzərdə tutulur.
[2] Bu misralarda deyilir: Şirin o qədər darıxır ki, səhər açılmır. Səhər açılanda təbil vurulur, həm də ulduzlar uçurlar. Burada şair demək istəyir ki, elə bil ulduzların ayağına tikan batıb, uçmur, təbilçinin də əlini ilan vurub səhərin açılmasını xəbər vermir.



Zarıyıb tanrıya dedi sözünü:
"Ey tanrı gecəmə bir nəhayət ver,
Mənə gündüz kimi qalibiyyət ver.
Sübhə ümidim yox, gecə qapqara,
Aç mənim üzümü nurlu bahara,
Şir kimi ərləri öldürər qəmim,
Qəmə şadlıq kimi qoy qalib gəlim.
Taqətim heç yoxdur bu dar zindana,
Ləltək məni daşdan sən çıxarsana!
Hər kəsin dadına çatırsan, Allah,
Mənə də özün ol bu gündə pənah.
And verirəm yetim ahü-zarına!
Məzlum qocaların fəryadlarına,
Miskin qəriblərin yatdığı yerə,
Quyu dibindəki ac əsirlərə,
"Adil Allah" — deyə çağıranlara,
Əfvlər diləyən çox günahkara,
Ürəyi fəth edən saf həqiqətə,
Ruhu canlandıran böyük ayətə...
Gördüyüm nemətlər bütün sənindir,
Nemətinlə yenə məni sevindir.
Mən səndən bu sirri gizləyim nədən?
Sən ki, hər bir sirri yaxşı bilirsən!"
Yalvardı tanrıya o təmiz ürək,
Düşdü torpaqlara öz göz yaşıtək.
O tutqun könlünü açdı yaradan,
Dəmir açarını çıxardı daşdan.
Dodağından qopan o yalvarışlar,
Xosrovun qəlbini etdi tar-mar.

## XOSROVUN OVA GETMƏSİ VƏ ORADAN ŞİRİNİN QƏSRİNƏ TƏRƏF AT ÇAPMASI

Qızıl bayrağını açanda aləm,
Dağılmış qoşuntək qaçıb getdi qəm[1]

[1] Bu beytdə səhərin açılması, Xosrovun qəminin dağılması göstərilir. Aləmin qızıl bayrağı — günəşə, dağılmış qoşun ulduzların yox olmasına işarədir. Beytin mənası: Səhər günəş doğan zaman ulduzlar yox olduğu kimi, Xosrovun da qəmi dağılıb getdi.

Ov eşqinə düşdü Xosrov bu zaman
Şikayəti yoxdu artıq baxtından.
Yenə də gül açdı baxtın fidanı,
Acıdan qurtardı Şirinin canı.
Şirinin üzütək uğurlu gündə
Çölə çıxdı Xosrov Şəbdiz belində...
Ov zamanı Xosrov kimsə duymadan,
Qəsri-Şirin tərəf olmuşdu rəvan.
Qəsrə bir az qalmış atı buraxdı,
Sanki bir mey idi, badəyə axdı.
Bu gecə dünyaya saçırdı ənbər,
Qışın soyuğuydu, əsirdi yellər.
Şaxtanın gücündən donmuşdu hər yan
Qılınc yaradırdı ipək sulardan[1].
Mötədil olsa da bu iqlim bir az,
Soyuq qabağında igidlik olmaz.
Şah əmr elədi ki, yandırılsın od,
Batmanlarla ənbər, xırmanlarla ud.
Qəmari ud yanır, ağac qovrulur,
Elə bil yağırdı havadan kafur[2].
Şah yorğundu, ona yer düzəltdilər,
Bərk yatdı axşamdan sabaha qədər...
Xosrov yatağından qalxdı üzüşən,
İşrətə başladı lap səhər tezdən.
Saqinin əlindən mey aldı, içdi
Meydən xumarlanıb, kədərdən keçdi.
Təsir eylədikcə ona al şərab,
Şirin həsrətilə çəkdi iztirab.
Şəbdizə atlandı məst ola-ola,
Qəsri-Şirin tərəf düzəldi yola.
Sərxoşluqdan qəlbi sevinclə dolu,
Dalınca gəlirdi neçə xas qulu.
Şirinə yetirdi xəbər kənizlər,
"Xosrov təkcə gəlib, bil, ey bixəbər!"

[1] Beytin mənası: Şaxta o qədər şiddətli idi ki, İpək kimi olan sular donaraq nizə və qılınca oxşayırdı.
[2] *Qəmari ud* — Qəmər yerinə məxsus ud, etirli maddə. *Kafur* — *kamfora* — xoş ətrə işarədir. Beytdə təbiətin ruh oxşayan zamanı olduğu göstərilir.



Qorxdu bədnamlıqdan ismətli Şirin,
Bu vaxtsız gəlişdən oldu çox qəmgin...
Şirin gördü belə sərxoş gəlir şah,
Taqəti kəsildi, çəkdi dərin ah.
Bihuş olub daldı öylə bir zaman,
Ayılanda yenə qalmışdı heyran.
Dedi: "Otağıma qoymasam əgər,
Ayrılıq yarası məni məhv edər.
Tünlükdən əl çəkib, bir az yumşalsam,
Dünyada Viysətək olaram bədnam[1].
Çalışaram xəta olmasın aşkar
Əgər bacarmasam, nə əlacım var?"
Şah gələndə bütün gözətçi, qulan,
Yollara zər, ipək sərdilər tamam...
Gül rəngli o ipək xalılar üstə,
Xosrov at sürərək yetişdi qəsrə.
Qəsrin qapısını bağlı görəndə,
Heyran qalıb, düşdü ürəyi bəndə.
Nə geri dönməyə bir üzü vardı,
Nə qapı qırmağa bir sözü vardı.
Bir quldan soruşdu: "O gümüş bədən,
Bizi qapısında saxladı, nədən?
Nə acılıq gördü məndən ki, Şirin,
Qapısını belə bağladı qəsrin?
Get söylə: "Şahənşah deyil, qul gəlib,
Sənə peyğamı var, uzaq yol gəlib...
İstəmirsən burda çox qalım əgər,
Səni ayaqüstü görsəm də yetər".
Belə zarıyaraq danışırdı şah,
Şirin qulaq asır, çəkirdi min ah...
Ətirli saç kimi rübəndi aldı,
Ay kimi parlayan üzünə saldı.
Hərəkəti tovuz, görkəmi humay,
Kəklik kimi süzdü o işıqlı ay.
Könül ovlamaqçın edirdi pərvaz,
Niyaza gələndə eyləyirdi naz.
Sallana-sallana gəldi eyvana,

[1] Fəxrəddin Gürgami adlı şairin "Veys və Ramin" poemasındakı Veysə işarə edilir.

Şahı görcək təzim eylədi ona.
Qulaqlarındakı daş-qaşı açdı,
Şəbdizin nalına hədiyyə saçdı.
Yüz dənə xoş sulu incini birbaş,
Xosrovun başına eylədi şabaş.

## XOSROVLA ŞİRİNİN SÖHBƏTİ

O ay sifətlini Xosrov görərkən,
Etdi öz qəlbini o sərvə çəmən.
Gördü ki, bir huri qəsrə girərək,
Behişt qapısını bağlayıb bərk-bərk.
Xosrovu sarsıtdı o birdən-birə,
Az qaldı kürsüdən şah düşsün yerə.
Cəld durub toxtaqlıq verdi özünə,
Əlini öpərək oturdu yenə.
Üzr üçün Şirinə sonra dil açdı,
Sorğularla ona şəkərlər saçdı:
"Həmişə təzə ol, ey sərvi-azad!
Başın göy, üzün al, qəlbin olsun şad!
Dünya sübh üzündən gülüş öyrəndi,
Fələklərə düşən sənin kölgəndi.
Könül təzələndi bu xoş görüşdən,
Məni utandırdın hörmətinlə sən.
Yolumu bəzədin öz mənzilintək,
Döşədin torpağa xalı, xəz, ipək.
O gövhər, aypara sırğalarından,
Şəbdizin nalına sən ləl salmısan.
Yoluma bu qədər gövhər tökmüsən,
Üzüm lələ dönüb xəcalətimdən.
Üzünlə ki, şadam-bu mənə bəsdir,
Bu gövhər, bu daş-qaş, məncə əbəsdir.
Südlə bal kimi sən qarışdın mənə,
Sözüm ola bilməz xidmətlərinə.
Qapını üzümə bağladın neçin?
Mən yanıldım, yoxsa belədir yəqin?
Alçaltmısan məni, gözəl, yer kimi,
Ucalmısan özün səmalar kimi.
Demirəm ki, səndən mən artığam, yox,



Belə fikirlərdən uzağam çox-çox.
Qonağınam, qonaq üzünə belə,
Qapını bağlamaq olarmı söylə?
Qonaqla oturan comərd kimsələr,
Qonağa daha çox hörmət göstərər.

## ŞİRİNİN XOSROVA CAVABI

Şirin açdı yenə gül dodağını,
Göstərdi bəhrəli xurma bağını.
Ləli üzündən mərcanı açdı,
Gövhərləri düzdü, mirvari saçdı[1].
Əvvəl dedi: "Şahım, yar olsun baxtın,
Səninlə bəzənmiş o tacın, taxtın.
Düşmənlərə qarşı görüm ki, sənin,
Bayrağın dik olsun, qılıncın kəskin.
Şərəfin, şöhrətin tutmuş hər yanı,
Qolunla əyilmiş göyün kamanı.
Yarından, dostundan razı qal hər an,
Bu qoca dünyaya sən bir dayaqsan".
Sonra da od kimi birdən dəyişdi,
Dedi: "İgid Xosrov, bu iş nə işdir?
Sən şahsan, get, şaha sevgi yaraşmaz,
Məcazi sevgidən heç vaxt kar aşmaz.
Kimin ki, dünyada bir məşuqu var,
Eləsi həqiqi bir aşiq olar.
Məni Fərhad üçün etmə məzəmmət,
O qərib ölmüşü hörmətlə yad et.
O mehribanlıqla Fərhad, inan ki,
Axirət qardaşım olmuşdu sanki.
O quru səsimi eşidən zaman,
Əyri baxmamışdı mənə bircə an...
Gəl Fərhad bəhsinə sən çək bir qələm,
Mən belə irada layiq deyiləm.
Elə bil yel əsdi qopdu bir tufan,
Bir yarpaq apardı sənin bağından,
Yurdsuz qoydu məni möhnət selləri,

[1] Yəni Şirin sözə başladı.

Sən yığ paltarını, burdan dön geri.
Qızğın od içində qaldım naəlac,
Sən məndən ibrət al, dayanma, tez qaç...
Halal ye, tərlantək halal ov ara,
Bənzəmə leş üstə qonan quşlara.
Mənim hər oyunum şirindir, sirin,
Odur ki, adımı qoyublar Şirin..."
Şirin sözlərini söyləyib ona,
Dedi ki: "huşyara, ağıllı canan,
Firuzə gülşənə and içirəm mən,
Nurlu, parlaq günə and içirəm mən.
And olsun cənnətdə nəqşi-nigara,
Torpaq fərfmanından yazılanlara,
And olsun ölümsüz əbədiyyətə,
And olsun yatmayan oyaq xilqətə.
And olsun fitrətə qida verənə,
Əqlə can, cansıza şəfa verənə.
Ki, şah olsan belə, kəbinsiz yenə,
Yetişə bilməzsən istəklərinə".
Bu sözlə çevirdi üzünü şahdan,
Tapdığı xəznədən əl çəkdi haman.

## XOSROVUN QƏSRİ-ŞİRİNDƏN MƏYUS QAYITMASI

...Şah nə qədər deyib, tökübsə tədbir,
O müşkin saçlıya etmədi təsir.
Çox nalə eylədi rəhm edə Şirin,
Faydası olmadı bu nalələrin.
Şah öz hiddətini artıran zaman,
Şirinin cavabı deyirdi qan-qan.
Qaranlıq gecədən keçdi bir qədər,
Şah qayıtdı ordan qəlbində kədər.
Xəstə adam kimi atı sürürdü,
Gözlərindən qanlı yaş süzülürdü.
Qəlbi yaralıydı, gözü nigaran,
Taqətsiz adamtək gedirdi yoldan,
Nə atı sürməyə ayağı vardı,
Nə əli Şəbdizə qamçı çalırdı.



Yola nisar etdi axan yaşları,
Gül üzündə vardı saysız mirvari.
"Nə olar, — deyirdi o sinəsi dağ,-
Qarşıma çıxaydı nə quyu, nə dağ.
Ləngidəydi onlar yolumdan məni,
Atıb getməyəydim mən bu məskəni".
Hirsindən ovurdı əlini bəzən,
Bəzən yaş silirdi nəm gözlərindən.
Qərargaha gəldi Xosrov ümidsiz,
Odtək yandırırdı qəlbini bir hiss.
Ay yarıb buludu göydə göründü,
Bir anda hər tərəf nura büründü.
Şah fələktək uca çadıra çatdı,
Çadırın ucunu yuxarı atdı.
Görünmür gözünə dünya bu gecə,
Beynini didirdi acı düşüncə.
Rahatlıq etməyə yoxdu heç meyli,
Qalmışdı dizində başı əyili.
Getdi nədim, vəzir, çadır boşaldı,
Axırda bir Şapur, bir Xosrov qaldı.
Fərəhlənsin deyə şah yavaş-yavaş
Naxışlar çəkirdi o usta nəqqaş.
Yanar ataşinə çiləyirdi su,
Gülürdü ki, getsin şahın qayğısı.
Deyirdi ki: "Şirin çox mehribandır,
Acısı dildədir, hirsi yalandır".
Xosrov, görəndə ki, Şapurla təkdir,
Dərdlərini açıb söylədi bir-bir:
"Gördün ki, başıma nə gəldi bu gün?
Rüsvay etdi məni o afət bütün.
O allahdan qorxmaz nə oyun qurdu,
Nə həya bilirdi, nə də qorxurdu...
Doğrudur, yar yara əziyyət verər,
Acı tikan kimi sancmaz bu qədər...
Bir kəsək üstünə quşu qonmayan,
Bir canana uymaq əbəsdir, inan.
Namuslı yar olsun,-hər dərddən halı,
Tovuzun yoldaşı tovuz olmalı".
Şapur yeri öpdü, dil açdı yenə,

Kafur suyu tökdü odun üstünə:
Dedi: "O tünddürsə, sən ol bir ipək,
Şahım, güzəşt etsin mərd adam gərək.
Aşiqlər qovğası şişmşəktək olar,
Naz ilə vəhşətin tafavütü var.
Üzrü var, istisə Şirin bu qədər,
Məşhurdur ki, şirin hərarət verər.
Bu tək Şirin deyil, heç tənə vurma,
Tumsuz olarmı heç, bir düşün, xurma?...
Bəxt öz sahibinə eyləsə çox naz,
Onun əzabından çəkinmək olmaz.
Pərgar hansı səmtə dolansa əgər,
Fırlanıb-fırlanıb yerinə dönər...
Bu çətinlik keçər, mən ümidvaram,
Yetib istəyinə, şah olar aram".
Şahı bu vədəylə eləyirdi şad,
Xərabəd bir könlü edirdi abad.
Uğurlu fal açdı taxtına şahın,
Doğsun bəxt ulduzu baxtına şahın.

## XOSROVUN GETMƏSİNDƏN ŞİRİNİN PEŞMANLAYIB ONUN ARDINCA QƏRARGAHA YOLLANMASI

Bu sözləri deyən müdrik ixtiyar,
Bu sayaq eylədi bizi xəbərdar:
Şah gedib, o dilbər qalanda yalqız,
Daş qəlbə daş vurub, oldu rahatsız.
Kirpiyindən axır dayanmadan yaş,
Döyürdü özünü o yavaş-yavaş.
Yanıqlı ahından hava susadı,
Axdı göz yaşları, yeri suladı.
Kirpiyi durmadan axıdırdı qan,
Hər nalə etdikcə olurdu nalan.
Yarımcan quş kimi səndələyirdi,
Nərgizdən səmənə dürr ələyirdi[1].

[1] Bu misrada işlədilən Nərgiz — göz; səmən — yanaq; dürr — göz yaşı deməkdir. Beytin mənası: Həyəcandan çırpınaraq gözlərindən yanaqlarına inci danələri axıdırdı (yəni ağlayırdı).



Əli gəlmir tutsun qəm ayağını,
Qüssə əritməsin ürək yağını.
Taqətsiz ürəyi şura gələrkən,
Utandı tutduğu qaba işlərdən
Gülgünə atlandı, yüyənni çəkdi,
Göz yaşı gül rəngli, at da gülrəngdi.
Atı tər içində gedəndə yenə,
Sanki su oturmuş odun üstünə...
Şahın dərgahından baxanda Şapur,
Görmüşdü bir atlı atını çapır.
Şapurun əfsunlu sözləri bu dəm,
Yuxuya vermişdi Xosrovu möhkəm.
Oyatmayıb əsla o yatmışları,
Şapur çıxıb getedi Şirinə sarı.
Dedi: "Kimsən burda, ey pəri, səslən!
Pəri deyilsənsə, de, nə gəzirsən?
Şir bu yerə gəlsə inan tük salar,
Qarıncaya dönər burda ilanlar".
O dilbər Şapuru tanıdı görcək,
Sıçradı Gülgündən yerə ceyrantək.
Təəcübdə qaldı Şapur bu işdən,
Yaxınlaşdı görsün kimdi bu gələn.
Sataşanda gözü o şux dilbərə,
Papaq göyə atdı, baş əydi yerə.
Söylədi: "Nə əcəb, ey pərisima!
Ayaq tozun bizə oldu tutiya"[1].
O gözəl Şapura niyaz eylədi,
Bir qadın diliylə tərif söylədi...
Onun məqsədini biləndə Şapur
And içdi, razıyam, doğru söz budur.
Gülgünü, Şəbdiztək tövləyə saldı,
Şirini Pərviztək eyvana aldı.
Şahın iki yerdə sarayı vardı,
Bəzəkdən ulduztək yanıb parlardı.
Biri göz önündə eyşü işrətçün,
Biri də xəlvətdə istirahətçün.
Şapur tez apardı o şux dildarı,

[1] *Tutiya* — gözə sürtülən dərman, yağ.

Yataqçün düzəltmiş çadıra sarı.
Əlindən yapışıb saldı içəri,
Gərdəyi bağlayıb qayıtdı geri.
Qəlbi şad üz tutdu şahın yanına,
Müntəzir dayandı şah fərmanına.
Gah gəzir gülşənin dörd bir yanını.
Gah da yandırırdı sönən şamını.
Şirin yuxusundan şah birdən qalxdı,
Göydəki ay kimi alnı parladı.
Dedi: "Sağ ol, Şapur, mən yuxlayırkən,
Sən taleyin kimi oyaq qalmısan.
Sənin iqbalınla yuxu görmüşəm,
Könlümdə qalmayıb nə kədər, nə qəm.
Yuxuda nə gördüm: səfalı bir bağ,
Hardansa əlimə keçdi bir çıraq.
Bu mehtab, bu şamla tökərək tədbir,
Gəl, mənim yuxumu sən eylə təbir".
Yuxunu yozmağa dil açdı Şapur,
Dedi: "Artıq olsun gözlərində nur.
Bu qaranlıq gecə bir ulduz olar,
O baldodaq gələr, yuxun düz olar.
Bunun sağlığına gəl şərab içək,
Yerlərə ləldən bir paltar biçək.
Gəl, sabah düzəldək bir yeni məclis,
Köhnə şərab olsun, bir təzə nərgis.
Şərqdə göstərəndə günəş üzünü,
Dənizdən qaldırıb kafur tozunu.
Kafur iyli meyi töküb camlara,
Bu qəm dəryasından çıxaq kənara".
Lalətək qızardı şah sevincindən,
Nərgiz kimi yumdu gözünü birdən.
Günəşin beşiyi düşərkən yola,
Cəmşid bəzəyini geyindi dünya...
Tez adam çağırdı, buyruq verdi şah:
qurulsun dağlarda böyük barigah.
Barigahın başı dəydi göylərə,
Bədnəzər xar olub, gömüldü yerə.
Altmışa bərabər eni-uzunu,
Camaat qul kimi sarmışdı onu.



Şahanə həmayil taxan hər sərhəng,
Bəzədi dərgahı qızıl heykəltək.
Bayraq qotazıtək əyib papağı
Deyləmilər kəsdi tez solu, sağı...
Girdə çadırlar da örtmüşdü düzü,
Qamaşırdı ayın, günəşin gözü.
Çadırdan birində oturmuşdu şah,
O birində Şirin çəkmədəydi ah.
Yerə şaha layiq saldılar zərbəf,
Min zinət alırdı ondan hər tərəf.
Torpapından dağ-qaş saçırdı külək,
Yel gətirən xəznə bu imiş, demək.
Carçı toplamışdı bütün həmdəmi,
Ora buraxmırdı bir naməhrəmi.
Şahın hərəmində yoxdu özgə kəs,
Bir hərəm qulları — lal kimi dinməz.
Müdrik nədimlərdən bir neçə nəfər,
Kürsünün üstündə əyləşmişdilər.
Hər yana — aşağı, həm də yuxarı,
Qoyuldu yaqutdan noğul qabları.
Hər kəsin əlində işlənən zərdir,
Qaş-daşlı bir turunc tacdır, ənbərdir.
Yumşaq qızıl [illegible] barmaq aralarından,
Çıxırdı şah onu sıxdığı zaman.
Saqi əlində camı, cam içində mey,
Nəğmələr səslənir, səslənirdi hey...
Dünyanı bürüyüb asiman kimi,
Barbəd gətirmişdi fəğanə simi.
Nəğməylə dostlara səfa verirdi,
Xəstə ürəklərə şəfa verirdi.
Qalxıb ucaldıqca udunun səsi,
Hər teli çalırdı Davud nəğməsi.
Zəngulə xoş səslə axıb gedirdi,
Nəfəsi İsatək can bəxş edirdi.
Manqala dönmüşdü əlindəki ud[1].

[1] "*Ud*" — sözünün iki mənası var: o həm çalğı aləti, həm də ətirli maddə adıdır. Beytin mənesı: Onun (Barbədin) əlindəki ud (çalğı aləti) manqal xasiyyəti daşıdığından ud (ətirli maddə) kimi öz nağməsilə könülləri yandırırdı.

Könüllər yanırdı onda sanki ud.
O, şəkər tökürdü çalan əliylə,
Yatırdı bərk gecəquşular belə...
Nikisa cəngiylə tufan edirdi,
Ərğənun telini dilləndirirdi.
Xosrov da onlara edərək rəğbət
Deyirdi: sizindir bu qəlb, bu dövlət.
Fırlanan çadırdan gün çəkilərkən
Gözəl pəri kimi ay doğdu birdən.
Şirin olan yerin ətrafında tək,
Dolanırdı Şapur bir pərvanətək.
Pərdənin ucunu qaldırıb canan,
Dedi: "Gəlsin biri çalğıçılardan.
Bu dərgahda gəlsin çənglə otursun,
Halımla ahəngdar bir mizrab vursun.
Halıma sazını uyğun eyləsin,
Hər nə kim, mən desəm, onu söyləsin!"

## ŞİRİNİN DİLİNDƏN NİKİSANIN NƏĞMƏ OXUMASI

Nikisa, necə ki, demişdi Şirin,
Bir qəzəl oxudu rast üstə həzin:
"Ey bəxtimin gözü, yatma, bir zaman,
Bəlkə səadətdən tapasan nişan.
Səbrin dağından çıx, ümmid səhəri,
İşıqlat qəlbimi, qov bu kədəri!
Ey bəxt, bir neçə gün gəl mənə yar ol,
Aç bağlı bəndimi, mənə açar ol!
Ey tale, yatma, bir məharət göstər,
Burax acizliyi bacarsan əgər.
Ey dost, hümmət elə, əl qaldır barı,
Qabağından qaçsın qəm qoşunları.
Ürək od içində, ciyər dolu qan,
Rəhm etmək istəsən, gəlmişdir zaman.
Bundan daha düşkün bir aciz olmaz,
Bundan daha yazıq kimsəsiz olmaz.
Ələ su tökməyə yaramasam da,
Qoya bilərəm ki, kababı oda.



Gər şərbət verməyə layiq deyiləm,
Şişə açmağı ki, yaxşı bilirəm.
Naxış salmasam da paltara əgər,
Üzərlik yandırmaq əlimdən gələr.
Tikə bilməsəm də ipək paltarı,
Ətəyindən tozu çırparam barı.
Məni kölgə kimi salma torpağa,
Ağlayıb düşmüşəm özüm ayağa.
Sənin kimi aya lazımdır Ülkər,
Qadanı almağa bir Zöhrə istər.
Gəlib sarayında qalaram müdam,
Şahlıq iddiam yox, kəniz olaram.
Halımı soruşsan, nə söyləyim mən?
Özün bunu məndən yaxşı bilirsən.
Düşün, necə olar qəm çəkən qərib?
Neyləsin işində aciz, müztərib[1].
Aşiqlikdə gültək yırtdım pərdəmi,
Görmədən buraxıb getdim aləmi.
Torpaqtək oxlara mən hədəf oldum,
Təzə lalə kimi gənc ikən soldum.
Bir ümidlə verdim dünyanı yelə,
Bir xülya üstündə olmuşam belə.
Nə bir arxam var ki, havadar ola,
Nə də bəxtim var ki, mənə yar ola.
Suda çılpaq batan belə demişdir:
"Ölüdə bəxt olsa, yenə bir işdir".
Yalqız oturmuşam, sızlayır yaram,
İstəyin budursa, razı olaram.
Mənim istədiyim gəlməsə ələ,
Qatlaşıb duraram, sən şadlıq elə.
Yoxsa mən acıyam, yaxınlaşırkən,
Ud kimi alışdım dodaqlarından.
Böyük bir şadlıqdır mənə bu yanğın,
Xoşdur belə yanmaq, bil, aşıqlarçın.
Mən buyruq vermirəm sənə, özün bil,
İstəsən gözümdən bu yaşları sil".

[1] *Müztərib* — burada iztirablı mənasındadır.

## ŞİRİNİN ÇADIRDAN ÇIXMASI

Xosrov ilə Şapur danışan zaman,
Gördülər qərq oldu bir nura cahan.
Çadırdan çıxdı o nazlı dilbər,
Çıxdı buludlardan elə bil qəmər.
Sərxoş əyyar[1] kimi göstərib ülfət,
Səcdə etdi şaha o gözəl afət.
Şah məşuqəsini ayaqda görcək,
Başının dürrünü torpaqda görcək.
Yer verdi başında o şux marala,
Gərək şahın tacı başında ola.
Əvəz verdi onun xidmətlərinə,
Birə on qat desəm, az olar yenə.
Mehribanlıq etdi, öpdü torpağı,
Sonra da istədi öpsün dodağı.
Xosrovun ürəyi şölələnirkən,
Şirinin qaşları çatıldı birdən.
Şah heyran qalmışdı: bu gülrəng sifət,
Neçin tez tutuldu, nədir bu illət?
Pıçıltıyla şaha söylədi Şapur:
"Əgər ay tutuldu, üzrü var, odur.
Çünki bu günəcən o qəlb parladan,
Yaxşı ad saxlamış eldə hər zaman.
İndi qorxur şahın hissi, xəyalı,
Ay üzünə qoysun xəcalət xalı".
Şah baxtı xoş barlı ağac toxmuna,
Gördü ki, peyvəndsiz əl yetməz ona.
Əhd etdi, söz verdi, and içdi, hərgiz,
Ona əl vurmasın əsla kəbinsiz.
Toplasın dünyanın böyüklərini,
Nigahla bənd etsin o dilbərini.
Lakin bu tədbirə bir az vaxt gərək,
İndiki camıma mey töksün, içək.
Açılsın alnımız, şad olaq bir az,
Belə xoş gecəni boş qoymaq olmaz.
Şahın ilqarından Şirin oldu şən,

[1] *Əyyar* — olduqca çevik, süratlə qaçan, bacarıqlı, əlindən hər iş gələn adam.



Ülkəri götürdü ayın üzündən.
Şadlanıb gülərək həvəsə gəldi,
Saçının hər teli bir rəqsə gəldi.
Qızıl bəzəklərin səsindən guya,
Oxuyub çalanlar getdi yuxuya.
Qızardı şərabtək pənbə dodaqlar,
Hamı bir qurtumdan oldu məst, xumar.
Ay çalğıçı olsa, günəş də saqi,
Şadlıqdan, nəşədən nə qalar baqi?
Ürək xumar oldu sərxoşlanaraq,
Gizli məqsədlərdən qaldılar uzaq...
Dostunun qəlbini əldə edərkən,
Şah gültək açıldı sevindiyindən.
Könlünü göz yaşı ovutdu şamtək,
Aya ulduz saçdı o ətək-ətək.
Kirpiklə gözünü dikmişdi oda,
Sanki ud yanırdı ay manqalında.
Gah sürtür nərgizin al qumaşına,
Gah sünbül saçını sarır başına...
Qıvrım saçlarını bəzən açardı,
Saçları da aya ətir saçırdı.
Başından çarqatı bəzən açaraq,
Oğlantək qoyurdu başına papaq...
Belə keyf çəkdilər bir həftə tamam,
İşləri üzr idi, naz idi müdam.
Gündüz keyf məclisi, şərab, çalğı, səs,
Nəşəsiz keçmirdi orda bir nəfəs...
Şah düşərgəsindən yola düzəldi,
Öz qoşunlarıyla paytaxta gəldi.
Ağzından getməmiş şərabın dadı,
Şəhərə gəlincə şadlıq başladı.
Bir ay sifətlinin qara qaşları,
Bəxşişlə bəzədi bütün diyarı.
Səxavətli edər kişini dövlət,
Yer zəngin olmasa, bar verməz, əlbət.
Dənizlər olmasa, yağmaz buluddan,
Yağış da yağmasa, yaranmaz ümman.
Cibi boş olandan bir bac alınmaz,
Köhnə xarabadan xərac alınmaz.

Şah dedi: "Bir gecə qoy münəccimlər
Yaxşıya, yamana baxsın bir qədər.
Qaranlıq gecəyə göz gəzdirərək,
Bir gün seçsinlər ki, olsun mübarək.
Ay gəcavəsini salıb o günə,
Bəlkə də gətirək günəş bürcünə".
Münəccimlər xeyli ölçüb biçdilər,
Toy üçün uğurlu bir gün seçdilər.

## XOSROVUN ŞİRİNİ QƏSRDƏN MƏDAİNƏ GƏTİRMƏSİ

Firuzə göylərə işıq saçıldı,
Sübhün gəlininin bəxti açıldı.
O gəlin özünə verib yaraşıq -
Çıxdı pərdəsindən, yayıldı işıq.
Bir bəzək düzəltdi Xosrov gəlinçin,
Günəş xəcalətdən büküldü çin-çin.
Min qaragöz dəvə üstü yun şallı,
Tükləri qırmızı, sarı xalxallı,
Min cavan köhlən at üstə yaraqlı,
Saf qızıl yəhərli, dəmir dırnaqlı,
Min baş qara rəngli ulduzgöz qatır
Ki, cövlan edəndə fələyə çatır...
Minlərlə ay üzlü, ipək libaslı,
Qulaq zər halqalı, papaq almazlı.
Min sandıq, min xəznə- içi cəvahir,
Şaha layiq sovqat düzüldü bir-bir.
Qızıl, ipək dolu məfrəşi, tayı,
Yüz nədir, beş yüzdən artıqdır sayı.
On kəcavə vardı tovuz quşutək,
Hərəsində bir qız — kəklikdən göyçək.
Bir kəcavə vardı Şirinçün ayrı,
Qızıldandı onun içi, bayırı.
Taqi-Kəsradan ta Bisütunacan
Qızıl qotaz atla dolmuşdu hər yan
Nizələr pozmuşdu yer ahəngini.
Bayraqlar dəyişdi göyün rəngini.
Parlaq kəcavələr, təxti-rəvanlar —



İçində gözəllər, igid cavanlar.
Yola şabaş səpən gözəllər yenə
Zərbəf salmışdılar ay üzlərinə.
Ürək əsir edən nə qədər gözəl,
Ceyran göz, müşki xal, ay üz, gümüş əl.
Hər bir sərv boylunun başındasa var,
İraqlılar kimi gözəl çutqular.
Köhlənlər belində qızlar gedirdi,
Saçlarını sanki qamçı edirdi.
Saçlara düzülmüş qızıl cərgələr,
Qızıl cərgələrdə mirvarilər tər.
Belə bir cəlalla, bu dəbdəbəylə,
Yaman göz dəyməsin bu canlı selə.
Xosrov əmr etdi ki, möbidlər gəlsin,
Müdriklər toplansın, məclis düzəlsin.
Şah dedi Şirinin hekayəsini,
Hamı heyran qalıb, kəsdi səsini.
Şah dedi: "Şirinə olmuşam aşiq,
Hər cürə hörmətə layiqdi, layiq.
Mənə mehribandır, özü saf, təmiz,
Kim yaşayar belə azad, ləkəsiz.
Qoy hərəmim olsun, sarayda qalsın.
Onunla fəxr edim, başım ucalsın.
Mey gül ilə xoşdur tuta birgə cam,
Hər quş öz cütüylə tez olar aram.
Öküz cüt olmasa kotanda əgər,
Tək öküzlə, deyin, yeri kim sürər?"
Hamısı sevindi, hamı oldu şən,
Dedilər: "Afərin bu işə, əhsən!""
Əlindən tutaraq Şirininin şah
Əmr etdi möbidə kəsilsin nikah.
Lazımi hazırlıq görüb gəlinçin,
Möbid qaydasıyla kəsildi kəbin.
Edincə Şirini şah öz gəlini,
Hərəmə göndərdi o nazənini.

## XOSROVLA ŞİRİNİN TOYU

Səadət bir gülü bəslərsə əgər,
Bəslədiyi gülə həvaskar istər.
Əvvəlcə tikərək tale bir papaq,
Şah başına qoyar vaxtında ancaq.
Üzgüçü dənizdən dürrü çıxardar,
Taxar öz tacına sonra hökmdar.
Şirin ki, olmuşdu təzə şanlı bal,
Xosrovu səslədi: "Bu badəni al!
İç, sənə nuş olsun, qəm çəkmə bir an,
Şirindən qeyrisi çıxsın yadından!"
Bir tərəfdən özü Xosrova gizlin,
Xəbər göndərdi ki: "Bəsdir, içməsin".
Dedi: "Bu gecəlik camı tərk elə,
İşrət məclisini quraq mənimlə.
İçkini sevirsən, Şirindən əl çək,
İki sərxoşluğa dözməz bir ürək.
Hər kəsin başını qızdırsa şərab,
Anlamaz duzludur ya şitdir kabab.
Əgər əli çatsa öz atəyinə,
Deyər ki: məst idim, bilmədim yenə.
Bir sərxoş eləsə yüz bikri[1] qarət,
Ayılıb unudar, belədir adət.
Çox sərxoş qıfılı özü açar şad,
Ayılıb oğrudan eyləyər fəryad".
Şirinin sözündən o şahi-əzəm,
Xoşlandı və dedi: "Ey gözəl sənəm!
Ancaq keyf günündə qəm çəkmək olmaz".
Çalğılar çalındı, qalxdı xoş avaz.
Nikisa oxuyur, Barbəd çalırdı,
Zöhrə bu səslərdən ləzzət alırdı.
Bəzən rud deyirdi: "Saqi, mey gətir,
Eşq olsun bu keyfə, sən bir cam yetir".
Şərab söyləyirdi Barbədə bəzən:
"Çal xoş olsun ilin keçən ilindən".
Şirinin adına cam doldurur hey,

[1] *Bikr* — bakirə, ərə getməmiş qız.



Şah ara vermədən içir peydərpey.
Dalbadal piyalə doldurub içdi,
Bu təhər gecədən bir xeyli keçdi.
Bir zaman gəldi ki, məclis bitərək,
Bəy gəlin yanına gedəydi gərək.
Şah sərxoş olaraq qaldı yerində,
Apardılar onu çiyinlərində...
Tovuz kimi yatdı iki nov cavan,
Tovuzlar çox gözəl olur yatarkən.
Qalxdıqda o Şirin yuxudan daha,
Çox şükür etdilər böyük allaha.
Sonra yuyundular oldular təmiz,
İbadət etdilər tanrıya səssiz.
Bir ay pozulmadı toyun ahəngi,
Öz yerində qaldı bəzəyi, rəngi.
Humeyla, Səməntürk, bir də Humayun,
Etdi əllərini xınayla gülgün.
Bir yerə yığaraq bir gün onları,
Xosrov geyindirdi gəlin paltarı.
Onlara yaraşan bəzək də verdi,
Gövhər, qızıl, daş-qaş, ipəkdə verdi.
Şapura verdi şah Humayunu tez,
Bir xurma yemişdi, bil, verdi əvəz.
Etdi Səməntürkü Barbədə gəlin,
Nikisaya dedi: Humeyla sənin.
Məhin Banunun da yerini bütün,
Şapura bəxş etdi hakimlik sürsün.
Şapurun əlinə keçəndə dövlət,
Tikdirdi o yerdə çoxlu imarət.
Dezqana ki, durur bu gün də belə,
Deyirlər tikilib Şapur əliylə.
Ondan sonra Xosrov bəxtiyar oldu,
Hər zaman taleyi ona yar oldu.
Səadət, səltənət, həm də cavanlıq —
Daha bundan yaxşı nə lazım artıq!
Gecə-gündüz içki, çal-çağır, söhbət,
Dünyanı yeyirdi çəkmirdi xiffət.
Dünyada ye, yaşa, sev bu aləmi,
Nəyinə lazımdır dünyanın qəmi!

Dünya bəxş edirdi, dünya yeyirdi,
"Əvəzdir pis günə bu keyf" deyirdi.
Bir müddət keçmədi, açıldı gözü,
Bu keyfcil həyatdan utandı özü...
Xosrov dönməsə də öz ilqarından,
Qorxudurdu onu vəfasız dövran.
Nərd atan görərdin bəzən Pərvizi,
Bəxtitək çapardı, bəzən Şəbdizi.
Gah Barbəd çalırdı, dinləyirdi şah,
Gah Şirini öpüb olurdu gümrah.
O təxt, Barbəd, Şəbdiz, ismətli Şirin,
Əlinə yetincə Xosrov Pərvizin.
Keçmişdəki yuxu yadına düşdü,
Abad ürəyinin qanı uyuşdu.
Bilirdi bu suda, torpaqda olan,
Xarabəyə dönüb gedər bir zaman,
Ay bədr olan zaman bürünər nura,
Uğrayar zavala get-gedə sonra.
Meyvə kal olduqda böyüyər, artar,
Yetişən zamanda yerə düşər bar.

## ŞİRUYƏNİN XASİYYƏTİ VƏ XOSROVUN İŞİNİN AQİBƏTİ

Xosrov öyrənərkən, dərsi, hikməti,
Tərk etdi dünyanı, eyşi, işrəti,
Məryəmdən olmuşdu bir kal övladı,
Şir kimi qorxulu, Şiruyə adı.
Beyni xərçəng dolu, zorba bir eşşək,
Ürək bulanırdı üzünü görcək.
Ala və göygözlü bir üzügülməz,
Ondan iyrənirdi rast gəlsə hər kəs.
Deyirlər bu oğul onca yaşında,
Min fikir bəslərmiş kinli başında.
Gəlin gələn zaman Şirin, baxaraq,
"Kaş mənim olaydı", — deyirmiş alçaq.
Sevdiyindən deyim, yoxsa kinindən,
Elmindən, bəxtindən, yoxsa dinindən?
Qaranlıq çökmüşdü ondan saraya,



İnciklik salırdı daim araya.
Şah Büzürgümidə dedi: "Əvvəldən,
Bu dönük oğuldan narazıyam mən.
Uğursuz insanlar çox yaman olar,
Taleyində onun min bir fəsad var.
Çox pis niyyətlərlə gəzir aləmi,
Anasına uymur canavar kimi.
Çıxmaz bu çirkindən bir yaxşı rəftar,
Məsəldir, deyərlər, oddan kül olar.
Fikri özündədir, çox xudpəsənddir,
Başqasını saymaz, özünə bənddir.
Onun nə huşu var, nə də vüqarı,
Uzaqdır onlardan, yoxdur heç arı.
Tüstü kimi çıxdı mənim odumdan,
Ancaq məni görcək yan qaçır hər an.
Mən şahlar başından tac aldım, ancaq
Oğlum naxələfdir, bir bəxtimə bax!
Nə mənə uyuşur, nə də Şirinə,
Bacılarıyla da düz gəlmir yenə.
Palanduza necə baxarsa eşşək,
Bu div o pəriyə baxır onuntək.
Məni gürzə bilir o gürzərəftar,
Yəqin ilanam ki, böylə xalım var.
Hər anadan olan övladdır məgər?
Hər çiçək bal verməz, hər qamış şəkər.
Qohumdan mehriban yadlar az deyil,
Həm vəfalı, sadiq, həm də şirindil.
Çox övlad öldürdü doğma ananı,
Dəmirdən incidi çox daşın canı".
Büzürgümid dedi: "Müdrik hökmdar,
Pak qəlbin hər işdən olmuş xəbərdar.
Dərdi-sər olsa da bu oğul sənə,
Öz gövhərindəndir bu parça yenə.
Yararmı olasan övladla düşman?
Ürək ayrılarmı saldığı bağdan?
Nar öz meyvəsini başında saxlar,
Odur təpik vurmaz ona hər murdar.
Tut öz meyvəsini yerlərə tökər,
Odur ki, təpikdən əziyyət çəkər.

Sən yaxşısan, o da pis olmayacaq,
Öz tumuna bənzər bar verən budaq.
Paltarçün biçilsə əgər zər parça;
Qızıldır biçimdə düşən hər parça.
Oğlun harındırsa, bundan zərər yox,
Zəmanə yumşaldar, qəm eyləmə çox.
Belə qaynar, coşğun cavanlığı var,
Qocalsa hər şeyi tamam unudar".

## XOSROVUN ÖLDÜRÜLMƏSİ

Ayın işığını gecə örtərək,
Div kimi azmışdı yolundan fələk.
Qaranlıq mey içmiş sərxoş zəncitək,
Dünyanın ağzını tikmişdi bərk-bərk.
Minəlli zəmanə düşmüşdü zordan,
Seçilmirdi mingöz fələk də kordan.
İki ayağında qızıldan zəncir,
Yatmışdı Şirinlə o böyük əsir.
Zəncir saçlı o büt hər gün yüz kərə,
Muncuq bağlayırdı bu zəncirlərə.
Şahın ayağını tez-tez ovaraq,
Zindanı edirdi bir pərqu yataq.
Eşqdən hekayə deyərdi nigar,
Hekayə səsinə rahat yatılar.
Şirin sözləriylə səpərdi şəkər,
Qoymayırdı şahı çəksin qəm, kədər.
Xosrov yatdı artıq, danışmaz oldu,
Şirinin gözləri yuxuyla doldu.
Hər iki sevgili yuxuya getdi,
Fələk yatmamışdı, gör nələr etdi!...
Pəncərədən girdi bir div sifətli,
Məhəbbət düşməni, çirkin xislətli.
Qəzəbdən qəssabtək bulaşmış qana,
Nəffattək od səpdi kini hər yana.
Oğru kimi evi gəzdi, dolaşdı,
Şahın yatağını tapıb yanaşdı.
Şahın ciyərinə xəncəri vurdu,
Şam söndü, Xosrovun ürəyi durdu.



Qəlbinə xəncəri vurduğu zaman,
Qanlı şimşək çaxdı sanki buluddan.
Aydan ayıraraq günəşi dərhal,
Uçdu pəncərədən o vəhşi qartal.
Oyandı padişah həycan içində,
Gözlərini açdı al-qan içində.
Axırdı sel kimi yatağında qan,
İncidirdi onu susuzluq yaman.
Öz-özünə dedi: "Çağırım Şirin
Mənə bircə qurtum sərin su versin".
Lakin könlü dedi: "Rəva deyil bu,
Gecələr doyunca yatmayıb yuxu.
Başıma gələni görərsə əgər,
Bir daha yatmayıb göz yaşı tökər.
Yaxşısı budur ki, qalsın diləyim,
Mən ölüm, qoy yatsın yorğun mələyim".
Şirini yuxudan oyatmadı o,
Belə ölüb getdi vəfalı Xosrov...

## ŞİRUYƏNİN ŞİRİNƏ SİFARİŞ GÖNDƏRMƏSİ

Şiruyə sevirdi çoxdan Şirini,
Kimsəyə açmırdı ancaq sirrini.
Şirinə gizlicə göndərdi xəbər
Ki: "Bir həftə dözsə, hər dərdi keçər.
İki həftəlik ay sonra gül kimi,
Açılar bağımda, oxşar qəlbimi.
Eylərəm onu dövlətli, mallı,
Xosrovdan da artıq cahü-calallı.
Zər, ipək səpərəm ayaqlarına,
Bütün xəzinəni verərəm ona".
Şirin bu sözləri birdən eşitcək,
Tündləşdi sirkətək, coşdu şirətək.
Al dilə tutaraq etdi onu ram,
İnandı Şirinə ölməli adam.
Sonra da Xosrovun bütün varını,
Təzə-köhnəsini, palpaltarlarını,
Yoxsula, möhtaca payladı Şirin,
Ondan razı qaldı hər yoxsul, miskin...

## XOSROVUN MƏQBƏRƏSİNDƏ ŞİRİNİN ÖZÜNÜ ÖLDÜRMƏSİ

Şirin yuxusundan ayıldı səhər,
Yeni təhlükədən verildi xəbər.
Həbəş qayıdarkən Həbəşistandan,
Kafur qabı sındı yolda bu zaman.
Qaladan baxırdı bir zənci aya,
O güldü girərkən ay bu qalaya.
"Bir tabut qurulsun! — Əmr etdi Şirin,-
Şahənşahə layiq, bəzəkli, zəngin!
Tutulsun o tabut gümüşə, zərə,
Çoxlu mirvariyə, saysız gövhərə!"
Kəyan qaydasında saxlayıb ayin,
Xosrovu qoydurdu tabuta Şirin.
O gün basdırmağa verildi qərar:
Səhərdən şəhidi dəfn etsin şahlar.
Cahangirlər olub piyadə yeksər,
Tabut dövrəsində səf çəkmişdilər.
Barbədin əlləri tutmurdu qələm,
Öz barmaqlarını etmişdi qələm.
Büzürgümid oldu ümidsiz artıq,
Söyüd yarpağıtək əsirdi yazıq.
Zəif, acı səslə edirdi fəryad:
Etdi könlümüzün evini bərbad?
Əcəm şahlarının dayağı hanı?
O kəskin qılıncı, bayrağı hanı?
Dünyanın Xosrovu nə oldu, heyhat...
Hanı Kəsra, Pərviz, hanı o büsat?
Köç başlayan zaman qarışar ara,
Tanınmaz nə Pərviz, nə Xosrov, Kəsra.
Kənizlər, qulamlar baş açıq, nalan,
Ortada sərvtək Şirin xuraman.
Sərxoş nərgizləri qara sürməli,
Təzə gəlin kimi xınalı əli.
Bir gövhər tənəsi sırğa yerində,
Saçının halqası çiyinlərində.
Bir ötrüyü vardı sarı nahidtək,
Əynində günəş tək qırmızı ipək.



Tabutun dalınca sərməst gedirdi.
O fitnəni görən fəryad edirdi.
Qırmayıb Xosrovla olan ilqarı,
Xuraman gedirdi bütün yolları.
Hər görən deyirdi: "Şirin sevinir,
Əsla qəmgin deyil, o fərəhlidir".
Şiruyə deyirdi: "Yaxın bir zaman,
Şirin olar ona qəlbən mehriban.
Şirin sərxoş kimi yolu gedirdi,
Şah sərdabəsinə eləcə girdi.
Tabutu Günbədə qoyub böyüklər,
Üz-üzə durdular sırada yer-yer.
Möbidlə danışıb son vida üçün,
Girdi məqbərənin içinə Şirin.
Qapını bağladı, qoy görməsinlər,
Yanaşdı tabuta əlində xəncər.
Götürdü örtüyü, tapdı yaranı,
Əyildi bir dəfə, öpdü yaranı.
Yaranın yerini öyrənən pəri,
O yerdən döşünə vurdu xəncəri.
Yatağı doldurdu isti, al qanı,
Təzələdi şahda köhnə yaranı.
Şahı qucaqlayıb düşdü yatağa,
Döş-döşə dayandı, dodaq-dodağa.
Sonradan ucaltdı öz naləsini,
Camaat eşitdi onun səsini:
"Qovuşdu tənə tən, yetdi cana can,
Aradan yox oldu işgəncə, hicran".
Xosrov məclisində yatan şəkərə,
Xoş olsun bu şirin yuxu yüz kərə.
Allaha xoş gələr hər mömin bəndə,
Bir dua edərsə, bura gələndə.
Desin: tanrım, əfv et o aşiqləri,
Bir cənnətə dönsün onların yeri!
Alqış bu ölümə, əhsən Şirinə!
Öldürən Şirinə, ölən Şirinə!
Məhəbbət yolunda ölüm budur, bax,
Canana belədir canı tapşırmaq.
Bil ki, namərd olmaz hər qadın olan,

Dərd çəkməyən kişi pisdir qadından.
Çox gözəl arvad var, mərdlikdə bir şir,
Çox ipək içində şirlər gizlənir.
Zülmün yollarında bir toz ucaldı,
Şümşada, nəsrinə vəlvələ saldı.
Qəmin dəryasından bir bulud qalxdı,
Dağlarda dağ kimi gur sellər axdı.
Havanı, torpağı birləşdirərək,
Çöllərin üstündən keçdi sərt külək.
Böyüklər bu sirdən tutanda xəbər,
Başlarına vurub nalə çəkdilər.
Çox sağ ol, ey dünya, ey dövran, əhsən,
Gəlini damada belə yetir sən!
Dünyada nə qədər rus var, zənci var,
Bundan daha yaxşı toy etməz onlar[1].
Bir taxta oturdu iki tacvər,
Məqbəri bağlayıb geri döndülər.
Məzarı tərk etdi o qəmli karvan,
Bu sözü yazdılar qayıdan zaman:
"Bu Şirindən başqa kimsə dünyada,
Özünü bir kəsə etməmiş fəda..."

[1] Bu beytdə rus- ağlıq əlaməti kimi gündüzə, zənci — qaralıq əlaməti kimi gecəyə işarədir. Beytin mənası: Dünya durduqca bundan yaxşı toy edilməyəcəkdir.



# LEYLİ VƏ MƏCNUN

## KİTABIN YAZILMASININ SƏBƏBİ

Bir gün nəşəliydim, aləm şad kimi,
Dəmlər içindəydim Keyqubad kimi[1].
Qaşlarım açıqdı, sanki bir kaman,
Qarşımda dururdu yazdığım divan.
Üzümə tutmuşdu güzgüsünü baxt,
Səadət saçımı darardı o vaxt.
Dəstə bağlamışdı güllərdən səhər,
Səhəri oxşardı yaqut şəfəqlər.
Könül pərvanəsi əlində çıraq,
Mən bülbül olmuşdum, məst olmuşdu bağ.
Bayraq qaldırmışdım söz zirvəsinə,
Hünər lövhəsini yazırdım yenə...
Bu zaman bir elçi gəldi eyvana,
Şahın məktubunu gətirdi mana.
On-on beş sətirdi şahın bu sözü,
Gözəl xətti ilə yazmışdı özü.
Hər hərfi bağ kimi güllər açmışdı,
Bir şəbçıraq[2] kimi şəfəq saçmışdı:
"Ey söz dünyasına hakim Nizami,
Qulluğa məhrəmsən, tut ilticamı.
Səhər yuxusunun pərdəsini at,
Yenə söz oynadıb bir sehir yarat.
Əqli heyran qoyan söz meydanında,
Min şirinlik göstər hər dastanında

[1] *Keyqubad* — İran tarixində Keyan sülaləsinin qüvvətli padşahlarından biri hesab edilir.
[2] *Şəbçıraq* — qaranlıqda parıldayan daş.

İstərəm Məcnunun böyük eşqinə,
Bir söz xəzinəsi açasan yenə.
Bakirə Leylitək, ey böyük ustad!
Şerdə iki-üç bakir söz yarat.
Deyim: bu şəkərdir, deyildir acı,
Deyim ki, bu sözdü başımın tacı.
Min eşq kitabından yüksək və təzə,
Sən öz qələminlə bir dastan bəzə.
Bu mövzu şahıdır bütün sözlərin,
Layiqdir bu sözə sənin hünərin.
Bu təzə gəlinə çəkəndə zəhmət,
Fars, ərəb diliylə vur ona zinət.
Sözün sərrafıyam, sən ki, bilirsən,
Təzəni köhnədən tez seçərəm mən.
Qüdrətin böyükdür, ona-on yarat,
Onda beş verməyi birdəfəlik at[1]
Kamal çövhərinin xəzinəsindən,
Gör, kimin sapına inci düzürsən.
Türk dili yaramaz şah nəslimizə,
Əskiklik gətirər türk dili bizə.
Yüksək olmalıdır bizim dilimiz,
Yüksək yaranmışdır bizim nəslimiz".
Qulluq halqasına düşdü qulağım,
Qan vurdu beynimə, əsdi dodağım.
Nə cürətim vardı ki, evdən qaçam,
Nə də gözüm vardı, xəzinə açam.
Ömrüm viran oldu, solub saraldım,
Bu əmrin önündə cavabsız qaldım.
Sirrimi deməyə bir məhrəm hanı?
Ona söyləyəydim bu macəranı.
Qəlbimdə can kimi əzizim olan,
Məhəmməd Nizami oğlum bu zaman,
Bu gözəl mövzuya könül verərək
Oturdu yanımda o bir kölgətək.
Öpdü ayağımı xeyli mehriban,
Dedi: "Ey göylərə meydan oxuyan,
"Xosrov və Şirin"i yazıb yaratdın,

[1] Ona on-saf qızıl; onda beş-qatışıq qızıl mənasındadır. Beytin mənası: Yazdıqların saf qızıl kimi qiymətli olsun, zəif misralar yazma.



Hər duyan könüldə bir zövq oyatdın.
Leyli-Məcnundan da yarat bir əsər,
Cüt olsun yazdığın qiymətli gövhər.
Bu gözəl mövzuda böyük sənət var,
Xoşdur qoşa gəzsə cavan tovuzlar.
Bir də ki, Şirvanşah, o baş hökmüdar
Şirvana, İrana olmuş şəhriyar.
O rütbə verəndir, nemət verəndir,
Şerə, sənətə də qiymət verəndir.
O səndən bir əsər edir iltimas,
Sən də hünər göstər o əsəri yaz".
Dedim: "Ayna üzlüm, sözündə möhkəm,
Sözün yerindədir, haqlısan bu dəm.
Lakin iki səmtə əsir ruzgar,
Fikir çox genişdir, könül mülkü dar.
Əfsanə dəhlizi dar olsa əgər,
Sənətin sözü də yolda ləngiyər.
Gərək söz meydanı gen olsun müdam,
Atını dördnala səyirtsin ilham.
Bu ayə olsa da aləmə bəlli,
Qəlbə gətirməyir şadlıq, təsəlli.
Şadlıqdır, eyhamdır sözün arğacı.
Bunlarla düzəlir söz ehtiyacı.
Kədərlə, zəncirlə bağlansa dastan,
Sözlər çılpaq olar, can sıxar, inan.
Onu həddən artıq bəzəsən əgər,
Dastanın üzünə ləkələr düşər.
Yoxsa çıxış yolu bu vəziyyətdən,
Mütləq bir neçə söz deməliyəm mən.
Bu dastanda nə bağ, nə ucalıq var,
Nə çalğı, nə şərab, nə xoşbaxtlıq var.
Qumsala, daşlığa ilham gedərmi?
Getsə də torpağa təsir edərmi?
Hər şer şadlıqla gəlsə nəfəsə,
Beyti hadisəylə başlayar rəqsə.
Odur ki, dünyada əzəl zamandan,
Kədərdən, qüssədən qaçmışdır insan.
Dərd yazan şairlər qanad salmışdır,
"Leyli və Məcnun"sa sözsüz qalmışdır...

İndi şah dil tökür bu təmtəraqla,
Deyir: "Bu kitabı adıma bağla".
Mənzil dar olsa da, bu gündən belə,
Mən Leyli-Məcnunu incəliyilə,
Bəzəyib bir zinət vurum ki, ona,
Gövhərlər səpilsin şahın yoluna.
Oxucu pərişan olsa da bundan,
Qoy eşqə can versin onda varsa can.
Yenə də öz oğlum dinlədi məni,
O açdı üzümə bu xəzinəni,
Ömrümün ilk gülü-o təkcə balam,
O ağız ləzzətim, o son piyalam.
Dedi: "Ey kəlamı əkizim ata[1]
Əsəri qardaşım, əzizim ata.
Yarat bu dastanı rəngli, boyalı,
Qoyma ki, süstləşə nəzmin xəyalı..."
Dörd min beytdən də çoxdu bu dastan,
Dörd aydan az vaxta yazmışam, inan!
Əgər başqa işlər olsaydı haram,
Bu, on dörd gecəyə olardı tamam.
Bu azad gəlini görən şad olsun,
Ona abad deyən, qoy abad olsun.
S.F.D. ili idi, rəcəbin sonu[2]
Çox gözəl şəkildə bəzədim onu.
Əgər tarixini söyləsəm əyan,
Dörd il keçmiş idi beş yüz həştaddan.
Sənətin əlilə tutdum bəzəyə,
Gətirib oturtdum bu kəcavəyə.
Şahımın mübarək gözündən başqa,
Kimsənin nəzəri dəyməsin ona.

[1] Nizaminin oğlu Məhəmməd atasının yazdığı əsəri özünə qardaş sayır, öz əkizi adlandırır.

[2] Ərəb əlifbasında hər hərf müəyyən say ifadə edir: S hərfi (üç nöqtəli)-500, F hərfi-80, D hərfi-4-ə bərabərdir. Şair bununla "Leyli və Məcnun"un yazıldığı tarixi göstərmişdir. Həmin rəqəmləri hesablayanda məlum olur ki, şairin bu əsəri hicri tarixi ilə 584-cü ildə, miladi tarixi ilə isə 1188-ci ildə yazılmışdır.



## OĞLUM MƏHƏMMƏDƏ NƏSİHƏT

Sən, ey ön dörd yaşlım, hər elmə yetgin!
Gözündə əksi var iki aləmin!
Yeddi yaşar oldun o zaman ki, sən,
Açıldın gül kimi, güləndə çəmən.
İndi ki, çatmışdır yaşın ön dördə,
Başın sərv kimi durur göylərdə.
Qəflətdə oynama, qeyrət vaxtıdır,
İndi hünər vaxtı, şöhrət vaxtıdır.
Ucalmaq istəsən, bir kamala çat,
Kamala ehtiram göstərər həyat.
Uşaqkən əslini sorsalar bir az,
Ağac bar verəndə cinsi sorulmaz!
Elə ki, böyüdün, belədir qayda,
Atanın adından sənə nə fayda?
Sən aslanlar kimi keç cəbhələrdən,
Yalnız hünərinin balası ol sən!
Səadət kamalla yetişir başa,
Xalqa hörmət elə, ədəblə yaşa...
Öz adına layiq işlər gör ki, sən,
Axırda utanma xəcalətindən.
Oğul, sözlərimə yaxşı qulaq as!
Ata nəsihəti faydasız olmaz.
Görürəm şöhrətdə ləyaqətin var,
Şerdə, sənətdə məharətin var.
Şairlik eləmə! Dövrə bax ki, bir,
Tərif əvəzinə pislənir şer.
Şerdən ucalıq umma dünyada,
Çünki Nizamiylə qurtardı o da.
Hərçəndi sənətin çox rütbəsi[1] var,
Həyata faydalı bir elmi axtar.
Bu əyri cizgilər cədvəlində sən,
Özünü şərh edib özünü öyrən!
Ol öz vicdanının sirrinə açar,
Çünki bu mərifət qəlbə nur saçar..
Bir elmi öyrənmək istədikdə sən,

[1] *Rütbə* — bu misrada növ mənasındadır.

Çalış ki, hər şeyi kamil biləsən.
Kamil bir palançı olsa da insan,
Yaxşıdır yarımçıq papaqçılıqdan.
Məndən söyləməkdir, səndən eşitmək,
Bir insan əliboş gəzməsin gərək.

## AZ DANIŞMAĞIN GÖZƏLLİYİ

Sözün də su kimi lətafəti var,
Hər sözü az demək daha xoş olar.
Bir inci saflığı varsa da suda
Artıq içiləndə dərd verir su da.
İncitək sözlər seç, az danış, az din,
Qoy az sözlərinlə dünya bəzənsin.
Az sözün incitək mənası solmaz,
Çox sözün kərpictək qiyməti olmaz.
Əsli təmiz olan saf mirvarılar,
Suya və torpağa min bəzək vurar.
Mədənlə dolsa da hər bir xəzinə,
Hər kiçik zərrəsi dərmandır yenə.
Ürəyi oxşayan bir dəstə çiçək,
Yüz xırman otundan yaxşıdır, gerçək!
Yüz ulduz yansa da göylərdə, inan,
Bir Günə baş əymək xoşdur onlardan.
Göydə parlasa da nə qədər ulduz.
Günəşdir nur verən aləmə yalnız.

## ŞADLIQLA XALQA XİDMƏT ETMƏK

Bir daş deyilsənsə, donub qalma sən,
Çolaq deyilsənsə, diribaş tərpən.
Keçənin üstünə vur ayağını,
Təmizlə keçənin toz-torpağını!
Daş-kəsək olsa da keçdiyin bu yol,
Rəqsində oynağan fələk kir[illegible] söl.
Bağışla atını, sən get piyad[illegible]
Sillələr yesən də mərd ol dunyada.
Bacarsan hamının yükünü sən çək,
İnsana ən böyük şərəfdir kömək.



Sən də əldən düşüb yorulsan əgər,
Sənin də yükünü bütün el çəkər.

## DASTANIN BAŞLANMASI

Bu söz incisini düzən zaman mən,
Belə danışmışdır bu nəqli deyən:
Ərəb torpağında bir kişi varmış,
Şöhrəti, hörməti aşıb daşarmış.
O imiş başçısı Amirilərin,
Abadmış torpağı olduğu yerin.
Yel kimi əsdikcə şöhrəti, şanı,
Ətirlə yuyarmış Ərəbistanı.
İnsanlıq elmində bolmuş hünəri,
Heyrətə salarmış o, dünyaləri.
Ondaymış ərəbin hər bir ixtiyarı,
Qaruna[1] bənzərmiş dövləti, varı.
Fəqirlər, qonaqlar razıydı ondan,
Bəxti çıxmamışdı öz qabağından.
O, bir xəlifətək məşhur olsa da.
Övladsız, işıqsız bir şamdı o da.
Sədəfdən daha çox oğul arardı,
Dənsiz sünbül kimi dən arzulardı.
Deyərdi bəxt gəlib imdada çatsın,
Onun da ağacı bir budaq atsın.
Özü sərv kimi qopsa kökündən,
Başqa sərv boy atsın onun mülkündən...
Övlad arzusuyla yanırdı qəlbi,
Ləl üçün sıxılan bir mədən kimi.
Onun naləsini eşitdi Allah,
Ona da bir oğul verdi bir sabah.
O, nar kimi gülər, çiçək kimi şən,
Min dəfə gözəldi nardan və güldən.
Onda gövhər üzlü bir sifət vardı,
Ge[illegible] sifətdən gündüz olardı.
[illegible]a baxan kimi oğlun üzünə,
Açdı xəzinəni ellər üzünə..

[1] *Qarun* — çox varlı-dövlətli bir adamın adıdır. Ədəbiyyatda var-dövlət ahibi kimi rəmzi mənada işlədilir.

Bir müddət dayələr göz oldu buna,
Süd verdi ərəbin bu ilk oğluna.
Zəmanə mehriban dayələr kimi,
Məhəbbət südüylə onu bəslədi.
Onun dodağına hər damla süddən,
Bir vəfa kəlməsi yazıldı bilsən!
Verilən mayədən körpəcik doydu,
Köksünə bir dostluq ürəyi qoydu...
Lalətək ağzını südlə islatdı.
Səmən yarpağıtək südlə boy atdı.
O, süd içindəki bala dönürdü,
Sanasan beşikdə Ay görünürdü.
Boy atıb ikicə həftəyə doldu,
Lap on dörd gecəlik ay kimi oldu.
Bilindi ondakı hünərlə vüqar,
Adını hünərli Qeys qoydular.
Güldü bir yaşında gözəl camalı,
Camala can verdi onun kamalı.
Suvardı körpəni eşqin əlləri,
Üzündə parladı sevda gövhəri.
Şadlıqla iki-üç yaşına çatdı,
Öz könül bağında azad boy atdı.
O, yetişən kimi yeddi yaşına,
Düzüldü bənövşə, lalə başına[1].
Böyüyüb on yaşa çatandan bəri,
Oldu gözəlliyi dillər əzbəri.
Kim onun üzünü görsə uzaqdan,
Ona can sağlığı dilərdi haqdan,
Atası gördükdə gülüb sevindi,
Məktəbə yolladı oğlunu indi.
Bilikli alimdən istədi kömək,
Ona gecə-gündüz sərf etsin əmək.
Ona yoldaş oldu bir bölük uşaq,
Sən bir onlardakı səadətə bax!
Hər uşaqda qorxu və ümid vardı,
Dərsinə, elminə can yandırardı.
Xırda oğlanlarla qızlar yanaşı,

[1] Beytin mənası: O, yeddi yaşına çatanda bənövşə rəngli teli lalə yanaqlarının ətrafına düzüldü.



Hamısı olmuşdu sıra yoldaşı.
Hərəsi bir yerdən, bir qəbilədən,
Bu ədəb evində öyrənirdi fənn.
Qeysin elm işində vardı hünəri,
Dodağı saçırdı söz inciləri.
Orada bakirə bir inci vardı,
Sırada Qeys ilə bir oturardı.
Hələ saf qalmışdı o gözəl dilbər,
Kamalı olmuşdu dillərdə əzbər.
Camalı Ay kimi, süd işıqlıydı,
Boyu sərv kimi yaraşıqlıydı.
Qəmzə xəncərini çəksəydi əgər,
Min sinə deşərdi o nazlı dilbər.
Ahu gözlərini süzsəydi bir an,
Yanıb məhv olardı bütün bir cahan.
Ərəb ayı kimi sifəti vardı,
Əcəm türkü kimi könül ovlardı.
Saçları gecəydi, çamalı bir bağ,
Sanki qara qarğa tutmuşdu çıraq[1]
Lələ bəzənmişdi püstəcik ağzı,
Şəkər dodaqlıydı o ellər qızı.
Nə qədər istəsən şəkər qırardı,
Yalnız şəkər deyil, ləşkər qırardı.
Qoynunda bəslərdi qızı gözəllər,
Sevərdi, oxşardı onu ağ əllər.
Dünyanın həyalı bir dilbəriydi,
Gənclik dastanının şah əsəriydi.
Onun miravirisi-alın təriydi,
Boyun həmayili-hörükləriydi.
Ənliyi anadangəlmə qırmızı,
Sürməni neylərdi o ellər qızı.
Öpərdi xalını qara telləri,
Zülfünə bağlıydı camal gövhəri.
Bir ona düşmüşdü hamının meyli,
Zülfü də "leyl"idi, adı da Leyli[2]
Qeys onu gördükdə heyrətdə qaldı,

[1] Camalı gecə kimi qara saçları arasından işıq saçırdı.
[2] *Leyl* — ərəbcə gecə (qara) mənasındadır. Yəni zülfü (saçı) gecə kimi qara, adı da Leyli idi.

